QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Noyabr 2015
08 (1072)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## Azərbaycan Müəllimlər İnstitutunun Azərbaycan Dövlət Pedaqoji Universitetinə qoşulması barədə

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

Pedaqoji kadrların müasir tələblər səviyyəsində hazırlanmasını təmin etmək, ali təhsil müəssisələrinin sayını optimallaşdırmaq, mövcud maddi-texniki və kadr potensialından istifadənin səmərəliliyini artırmaq məqsədi ilə Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

1. Azərbaycan Müəllimlər İnstitutu Azərbaycan Dövlət Pedaqoji Universitetinə qoşulsun.

2. Azərbaycan Müəllimlər İnstitutunun Ağcabədi, Cəlilabad, Qazax, Quba, Şamaxı, Şəki və Zaqatala filialları Azərbaycan Dövlət Pedaqoji Universitetinin filialları hesab olunsun.

3. Azərbaycan Respublikasının Nazirlər Kabinetinə tapşırılsın ki, bir ay müddətində:

3.1. qüvvədə olan qanunvericilik aktlarının bu sərəncama uyğunlaşdırılması barədə təkliflərini hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

3.2. Azərbaycan Respublikası Nazirlər Kabinetinin və müvafiq mərkəzi icra hakimiyyəti orqanlarının normativ hüquqi aktlarının bu sərəncama uyğunlaşdırılmasını təmin etsin və bu barədə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

3.3. bu sərəncamdan irəli gələn digər məsələləri həll etsin.

4. Azərbaycan Respublikasının Təhsil Nazirliyi Azərbaycan Respublikasının Maliyyə Nazirliyi və Azərbaycan Respublikasının Əmlak Məsələləri Dövlət Komitəsi ilə birlikdə bu sərəncamın icrası nəticəsində qənaət olunan maliyyə vəsaitinin Azərbaycan Dövlət Pedaqoji Universitetinin elmi-pedaqoji potensialının gücləndirilməsinə yönəldilməsini, həmçinin azad olmuş maddi-texniki bazadan təhsil sisteminin məqsədləri üçün istifadə olunmasını təmin etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 26 noyabr 2015-ci il*

## ADPU-da Yeni Azərbaycan Partiyasının yaranmasının 23 illiyi qeyd edilib

Noyabr ayının 20-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Yeni Azərbaycan Partiyasının (YAP) yaranması-




nın 23-cü ildönümünə həsr edilmiş tədbir keçirilib. Tədbir iştirakçıları əvvəlcə ümummilli liderimiz Heydər Əliyevin ADPU-dakı abidəsi önünə gül dəstələri qoyaraq, xatirəsinə ehtiramlarını bildiriblər. ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov çıxış edərək bildirib ki, noyabr ayının 21-də xalqımızın dahi oğlu, ulu öndərimiz Heydər Əliyevin yaratdığı, təşkilatlandırdığı, qurduğu və Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin Sədri olduğu YAP-ın yaranmasının 23-cü ildönümü tamam olur. YAP-ın yaranmasının 23-cü ildönümü ilə əlaqədar respublikamızda müxtəlif tədbirlər keçirilir. Bizim bugünkü tədbirimiz də YAP-ın yaranmasının 23-cü ildönümünə həsr edilib.

Rektor Y.Məmmədov qeyd edib ki, biz bu gün YAP-ın yaranma tarixinə, keçdiyi böyük və şərəfli inkişaf yoluna və eyni zamanda onun cəmiyyətimizin bugünkü həyatındakı roluna qiymət vermək üçün ilk növbədə, ölkəmizdə 1988-1993-cü illərdə baş verən ictimai-siyasi hadisələrə diqqət yetirməliyik. Azərbaycan xalqının 1988-ci ildə SSRİ-nin süqutu prosesi və Dağlıq Qarabağ münaqişəsi ilə əlaqədar başlayan milli-qurtuluş hərəkatı bir çox müsibətlərlə, faciələrlə üzləşməli olurdu. Belə ki, mərkəzi hakimiyyət öz imperiya iddialarından əl çəkməyərək, Azərbaycan xalqının istiqlal mübarizəsini qanla, zorakı yollarla beşiyində boğmağa çalışırdı. Xalqımıza qarşı əsrin əvvəllərində olduğu kimi, yenə də əsassız ərazi iddiaları işə salınmışdı. Ermənilərin öz havadarlarının köməyi ilə Dağlıq Qarabağın Azərbaycandan alınaraq Ermənistana birləşdirilməsi iddiaları ilə başladıqları müharibə bunu bir daha təsdiqlədi. Eyni zamanda azərbaycanlıların tarixi torpaqları sayılan Qərbi Azərbaycandan zorla deportasiya edilməsinə başlanılmışdı. Azərbaycanlılar həm Dağlıq Qarabağda, həm də Qərbi Azərbaycanda ağır təhqirlərə, fiziki-mənəvi işgəncələrə məruz qalır, onların ev-eşikləri yandırılır, qətlə yetirilirdilər. 1988-ci ilin dekabrında 250 mindən çox soydaşımızın Qərbi Azərbaycandan deportasiya edilməsi də xalqımıza qarşı yönəldilmiş bir cəza tədbiri idi. Üstəlik də, ölkə daxilində yaranan hərc-mərclik, özbaşnalıq vəziyyəti daha da ağırlaşdırırdı. Həmin tarixi zaman kəsiyində ölkə rəhbərliyində təmsil olunan şəxslərin səriştəsizliyi, bəzi hallarda isə milli maraqlarımıza xəyanət etmələri də faciələrin baş verməsinə şərait yaradırdı. 1990-cu il yanvarın 19-dan 20-nə keçən gecə Bakıda 20 Yanvar faciəsi törədildi. Lakin xalqımızın başına gətirilən bəla və faciələr yalnız bununla bitmədi. 1992-ci il fevralın 25-dən 26-na keçən gecə Xocalı yerlə-yeksan edildi, bunun ardınca isə digər rayonlarımız işğal edildi. Belə ağır və faciəli durumda xalqın yeganə ümid, inam yeri isə, ulu öndərimiz Heydər Əliyev idi. Ümid dolu baxışlar Naxçıvana - ulu öndər Heydər Əliyevə yönəlmişdi. Vətənpərvər ziyalılarımız Azərbaycanı düşdüyü ağır vəziyyətdən xilas etmək üçün yeni bir siyasi partiya yaratmaq və onun rəhbərliyinə xalqımızın dahi oğlu Heydər Əliyevi dəvət etmək qərarına gəldilər. 1992-ci il oktyabr ayının 10-da «Əlincə» Xeyriyyə Cəmiyyətinin iclasında bu partiyanın yaradılması və ulu öndər Heydər Əliyevə müraciət edilməsi qərara alındı. Bu müraciət 1992-ci il oktyabr ayının 16-da «Səs» qəzetində dərc olundu. Həmin müraciətə 91 nəfər millətsevər ziyalı - Azərbaycanın görkəmli alimləri, ictimai xadimləri imza atmışdılar. Qürur hissi ilə deyə bilərik ki, həmin 91 vətənpərvər ziyalıdan 11 nəfəri ADPU-nun müəllimləri olmuşdur.

Ulu öndər Heydər Əliyev 1992-ci il oktyabrın 23-də həmin müraciətə cavab verdi. Beləliklə, 1992-ci il noyabr ayının 21-də Naxçıvanda ümummilli lider Heydər Əliyevin rəhbərliyi ilə YAP-ın təsis konfransı keçirildi. Xalqımızın böyük oğlu Heydər Əliyev yekdilliklə partiyanın sədri seçildi. "YAP Ulu Öndərimizin rəhbərliyi altında xalqımızın müstəqillik uğrunda mübarizəsi tarixinə yeni, parlaq bir səhifə yazdı.

Rektor Y.Məmmədov çıxışına davam edərək bildirib ki, YAP böyük və şərəfli yol keçib. Xalqımız həm YAP-ın yaradıcısı və qurucusu, ümummilli liderimiz Heydər Əliyevin, həm də Ulu Öndərimizin müdrik dövlətçilik kursunun layiqli davamçısı, Prezident İlham Əliyevin rəhbərliyi altında həyatımızın bütün sahələrində böyük uğur və nailiyyətlər qazanmışdır. Bu gün öz sıralarında təxminən 650 minə yaxın məsləkdaşı birləşdirən YAP ölkəmizin ən güclü və ən nüfuzlu siyasi təşkilatıdır. YAP monolit partiyadır, cəmiyyətimizin avanqardıdır, qüdrətli siyasi qüvvədir. YAP yalnız ölkəmizdə deyil, eləcə də Cənubi Qafqazda ən güclü siyasi partiyadır. Xalqımızın böyük elm və təhsil xadimləri, görkəmli ziyalıları məhz bu partiyada təmsil olunurlar.

YAP sözün həqiqi mənasında əsl ümumxalq partiyasıdır. Geniş sosial bazaya malik olan YAP-ın sıralarında cəmiyyətin bütün təbəqələri təmsil olunur ki, bu da onun ümumxalq partiyası olduğunu söyləməyə tam əsas verir. Məhz bütün bu müsbət xüsusiyyətlərin nəticəsidir ki, YAP 1993-cü ildən bu günə kimi respublikamızda keçirilmiş 5 prezident seçkisində, 5 parlament və 4 bələdiyyə seçkisində parlaq qələbə qazanmışdır. V çağırış Milli Məclisə noyabr ayının 1-də keçirilən seçkilərdə

**(Davamı 2-ci səhifədə)**



# ADPU-da Yeni Azərbaycan Partiyasının yaranmasının 23 illiyi qeyd edilib

(Əvvəli 1-ci səhifədə)

YAP-ın böyük üstünlüklə qalib gəlməsi də bu siyasi təşkilatın alternativi olmadığını bir daha ortaya qoydu. YAP builki parlament seçkilərində 69 deputat mandatına sahib oldu. YAP həm də öz fəaliyyətində gənclərin və qadınların irəli çəkilməsinə, onların dövlət idarəçiliyində təmsil olunmasına xüsusi diqqət yetirir.

Azərbaycan iqtisadi cəhətdən sürətlə inkişaf edir. Paytaxtımız Bakı şəhəri, rayonlarımız günü-gündən abadlaşır, gözəlləşir. Ölkəmizə gələn qonaqlar Bakını Avropanın və eləcə də dünyanın ən gözəl şəhərləri ilə müqayisə edirlər. Azərbaycanda elmə, təhsilə dövlət səviyyəsində böyük qayğı və diqqət göstərilir. Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili, UNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyevanın təhsil, səhiyyə, mədəniyyət, incəsənət və həyatımızın digər sahələrinə göstərdiyi yüksək qayğı və diqqət hər birimizin böyük razılığına səbəb olur. Ölkəmizin beynəlxalq siyasi nüfuzu durmadan yüksəlir.

Dövlət başçımız İlham Əliyevin qeyd etdiyi kimi, artıq keçid dövrünü başa vurmuş Azərbaycan yaxın gələcəkdə dünyanın inkişaf etmiş ölkələri sırasına daxil olmağı öz başlıca hədəfi seçib. Şübhəsiz ki, bu böyük uğurların qazanılmasında YAP-ın da özünəməxsus böyük xidmətləri var.

Rektor Y.Məmmədov bildirib ki, YAP-ın Səbail rayon təşkilatının 23 min üzvü var. "Pedaqoqlar" ilk ərazi partiya təşkilatı rayon təşkilatının aparıcı yerli təşkilatıdır. "Pedaqoqlar" ilk ərazi partiya təşkilatının ADPU-da 9501 nəfər üzvü var. Bu təşkilat həm rayon miqyasında, həm də respublika miqyasında keçirilən bütün ictimai-siyasi tədbirlərdə fəal iştirak edir.

Sonra tədbir Heydər Əliyev Muzeyinə və "Heydər Əliyev məktəbinin lektoriyası"nda baxış keçirilməsi ilə davam etdirilib. Rektor Y.Məmmədov Heydər Əliyev Muzeyində və "Heydər Əliyev məktəbinin lektoriyası"nda tələbə-gənclərə Ulu Öndərin həyat və fəaliyyətinin müxtəlif məqamlarını əks etdirən çoxsaylı fotoşəkillər və sənədlər əsasında ətraflı məlumat verib, onlara Heydər Əliyevin həyat və fəaliyyətini dərindən öyrənməyi tövsiyə edib.

**Mənsur İBRAHİMLİ**

*Bəxtiyar Vahabzadə-90*

# Düşünən və düşündürən poeziya

## ADPU-da Xalq şairi Bəxtiyar Vahabzadənin 90 illik yubileyinə həsr olunmuş "İnsan və zaman" mövzusunda Respublika elmi-praktik konfransı keçirilib



Noyabr ayının 26-27-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Xalq şairi Bəxtiyar Vahabzadənin 90 illik yubileyinə həsr olunmuş "İnsan və zaman" mövzusunda Respublika elmi-praktik konfransı keçirilib. Konfransdan öncə universitetdə Bəxtiyar Vahabzadənin həyatı və zəngin ədəbi irsi ilə bağlı sərgi nümayiş etdirilib və əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov konfransı giriş sözü ilə açaraq bildirib ki, Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev bu il yanvar ayının 14-də "Bəxtiyar Vahabzadənin 90 illik yubileyinin keçirilməsi haqqında" Sərəncam imzalamışdır. Dövlət başçımızın imzaladığı həmin Sərəncamda göstərilir ki, 2015-ci ilin avqust ayında Azərbaycanın Xalq şairi, tanınmış dramaturq, ədəbiyyatşünas və ictimai xadim, SSRİ-nin və Azərbaycan Respublikasının Dövlət mükafatları laureatı, Azərbaycan Milli Elmlər Akademiyasının həqiqi üzvü, professor Bəxtiyar Mahmud oğlu Vahabzadənin anadan olmasının 90 illiyi tamam olur. Bəxtiyar Vahabzadə Azərbaycan ədəbiyyatı tarixinin xüsusi mövqeyə malik görkəmli simalarındandır. Sənətkarın insanı daim mənəvi ucalığa səsləyən poetik-fəlsəfi məzmunlu yaradıcılığı milli poeziyada vətəndaşlıq ruhunun qüvvətlənməsində və ədəbi-ictimai fikrin istiqlal ideyaları ilə zənginləşməsində böyük rol oynamışdır. Tarixi-mədəni dəyərlərə ehtiram və ana dilinin saflığının qorunması Bəxtiyar Vahabzadənin fəaliyyətinin mühüm istiqamətlərindən birini təşkil edirdi. Adıçəkilən Sərəncamda milli ədəbi fikrin inkişafına dəyərli töhfələr bəxş etmiş Xalq şairi Bəxtiyar Vahabzadənin 90 illiyinin keçirilməsini təmin etmək məqsədi ilə Mədəniyyət və Turizm Nazirliyinin Azərbaycan Milli Elmlər Akademiyası və Təhsil Nazirliyi ilə birlikdə, Azərbaycan Yazıçılar Birliyinin təkliflərini nəzərə almaqla, bu qüdrətli söz ustadımızın 90 illik yubileyinə həsr olunmuş tədbirlər planını hazırlayıb həyata keçirmələri qarşıya qoyulmuşdur. Bununla yanaşı, Azərbaycan Prezidenti İlham Əliyev bu il oktyabr ayının 27-də "Şəki şəhərində Bəxtiyar Vahabzadənin ev-muzeyinin yaradılması və yaşadığı binaya xatirə lövhəsinin vurulması" haqqında da Sərəncam imzalamışdır. Bu Sərəncamda qeyd edilir ki, Azərbaycan ədəbiyyatının görkəmli simalarından biri, Xalq şairi, tanınmış ictimai xadim, SSRİ və Azərbaycan Respublikasının Dövlət mükafatları laureatı, akademik Bəxtiyar Vahabzadənin azərbaycançılıq məfkurəsinə sədaqət və tarixi-mədəni dəyərlərə ehtiram aşılayan, istiqlal ideyaları ilə zəngin yaradıcılığı milli ədəbi fikir xəzinəsinə qiymətli töhfə təşkil edir. Sözügedən Sərəncamda Xalq şairi Bəxtiyar Vahabzadənin Azərbaycan mədəniyyətinin inkişafında böyük xidmətlərini nəzərə alaraq Şəki şəhərində ev-muzeyinin yaradılması və Şəkidə yaşadığı binaya xatirə lövhəsinin vurulması ilə bağlı zəruri tədbirlərin həyata keçirilməsinin təmin edilməsi öz əksini tapmışdır.



Rektor Y.Məmmədov qeyd edib ki, Təhsil naziri hörmətli cənab Mikayıl Cabbarov da bu il fevral ayının 13-də təhsil müəssisələrində Bəxtiyar Vahabzadənin 90 illik yubileyinə həsr olunmuş tədbirlərin keçirilməsi barədə müvafiq əmr imzalamışdır. Bizim bu gün keçirdiyimiz Respublika elmi-praktik konfransı da yuxarıda qeyd etdiyim müvafiq Sərəncama və əmrə uyğun olaraq keçirilən bir elmi tədbirdir. Onu da qeyd etmək istəyirəm ki, dövlət başçımızın imzaladığı müvafiq Sərəncamın və Təhsil nazirlinin əmrinin icrasını təmin etmək məqsədilə bu il oktyabr ayının 20-də universitetdaxili əmr imzalanmış və həmin əmrlə hazırlanmış tədbirlər planı təsdiq olunmuşdur. Tədbirlərin hazırlanması və keçirilməsi üçün universitetdə mənim sədrliyimlə 15 nəfərdən ibarət Təşkilat Komitəsi yaradılmışdır. Qeyd etdiklərimizlə bərabər, ADPU-nun filoloq alimlərinin Bəxtiyar Vahabzadənin 90 illik yubileyi ilə bağlı ölkə mətbuatında çoxsaylı yazıları dərc edilmiş, televiziya




proqramlarında çıxışları olmuşdur.

Rektor Y.Məmmədov çıxışında böyük söz ustadımız, istiqlal şairimiz Bəxtiyar Vahabzadənin həyat və yaradıcılığı ilə bağlı məlumat verib. Qeyd edib ki, Bəxtiyar Vahabzadə 1925 -ci il avqust ayının 16-da Şəki şəhərində fəhlə ailəsində anadan olmuşdur. 1934-cü ildə ailəsi Bakı şəhərinə köçmüşdür. Bakıda orta məktəbi bitirdikdən sonra 1942-1947-ci illərdə Azərbaycan Dövlət Universitetinin (indiki BDU) Filologiya fakültəsində təhsil almışdır Universitetin aspiranturasında saxlanılmış, 1951-ci ildə "Səməd Vurğunun lirikası" mövzusunda namizədlik dissertasiyası, 1964-cü ildə isə "Səməd Vurğunun həyat və yaradıcılığı" mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. Bədii yaradıcılığa 1943 cü ildə "Ana və şəkil" adlı ilk şerini çap etdirməklə başlamışdır. Şair, dramaturq, ədəbiyyatşünas B.Vahabzadə 1945-ci ildən Azərbaycan Yazgzglar Birliyinin üzvü olmuşdur. O vaxtdan dövri mətbuatda şeirləri, elmi məqalələri, rəyləri müntəzəm çap olunmuşdur. "Mənim dostlarım" adlı ilk kitabında toplanmış lirik şeirlərində faşizmlə mübarizədə qalib çıxmış xalqın duyğu və düşüncələri öz əksini tapmışdır. Onun lirik şeir və poemalarında, mənzum pyeslərində müasir dövrün problemləri lirik-fəlsəfi planda, yeni əlvan boyalarla təsvir edilir. 1976-ci ildə "Leninlə söhbət" və "Muğam" poemalarına görə Azərbaycan Dövlət mükafatına layiq görülmüşdür. 1960-2003-cü illərdə "İkinci səs", "Vicdan", "Yağışdan sonra", "Yollara iz düşür", "Fəryad", "Hara gedir bu dünya", "Özümüzü kəsən qılınc", "Cəzasız günah", "Dar ağacı", "Rəqabət" pyesləri Azərbaycan Dövlət Akademik Milli Dram Teatrında tamaşaya qoyulmuşdur.

B.Vahabzadə tənqidçi-ədəbiyyatşünas kimi də fəaliyyət göstərmiş, 1950-1990-cı illərdə ADU-da Müasir Azərbaycan ədəbiyyatı kafedrasının professoru vəzifəsində çalışmışdır. 1974-cü ildə "Əməkdar incəsənət xadimi" fəxri adına layiq görülmüşdür. 1980-ci ildə AMEA-nın müxbir üzvü, 2000-ci ildə isə həqiqi üzvü seçilmişdir. 1981-ci ildə SSRİ Yazıçılarının VII qurultayında SSRİ Yazıçılar İttifaqı İdarə Heyətinin üzvü seçilmişdir. 1984-cü ildən Xalq şairidir. 1984-cü ildə SSRİ Dövlət Mükafatı laureatı, 1988-ci ildə isə M.F.Axundov adına ədəbi mükafatın laureatı olmuşdur. O, həmçinin Azərbaycan Yazıçılar İttifaqının İdarə Heyətinin və Ağsaqqallar Şurasının üzvü idi. Ədəbi-bədii prosesin yorulmaz bilməyən təbliğatçısı və təşkilatçısı kimi tanınırdı.

B.Vahabzadə həm də fəal ictimai xadim idi. Azərbaycan KP Bakı Şəhər Komitəsinə üzv və bir neçə çağırış Bakı Xalq Deputatları Sovetinə və X çağırış Azərbaycan Ali




Sovetinə, 1995 və 2000-ci illərdə isə Azərbaycan Milli Məclisinə deputat seçilmişdir. "Qırmızı Əmək Bayrağı" və "İstiqlal" (1995 ) ordenləri ilə təltif olunmuşdur.

Həmişə milli azadlıq, müstəqil dövlət ideyası ilə yaşayan B.Vahabzadə bu mövzuda qələmə aldığı "Gülüstan" adlı poemasında ikiyə bölünən Azərbaycan türklərinin yaşadığı faciənin bədii əksini vermişdir. Bu poemaya görə 1962-ci ildə şair "millətçi" damğası ilə ADU-dan çıxarılmış, yalnız 2 ildən sonra işə bərpa edilmişdir. Professor Şirməmməd Hüseynov Bəxtiyar Vahabzadənin işdən çıxarılmadığını bildirir: "Bəxtiyarı işdən çıxara bilməzdilər, çünki bu, ciddi ajiotaja səbəb ola bilərdi. Məcburən onu doktorluq müdafiəsi üçün elmi məzuniyyətə göndərdilər".

(Davamı 3-cü səhifədə)

# Düşünən və düşündürən poeziya

(Əvvəli 2-ci səhifədə)

İstiqlal duyğulu şairimiz B.Vahabzadə Sovet rejimində milli varlığı tapdanan, hər cür məhrumiyyətlərə məruz qalan millətin dərdlərini rəmzlər və müxtəlif ədəbi üsullarla ifadə etmiş, irihəcmli poemaları və pyeslərində hadisələri ya tarixə, ya da başqa ölkələrə keçirərək öz millətinin dərdlərini dilə gətirmişdir. Məhz ulu öndərimiz Heydər Əliyevin qayğı və himayəsi nəticəsində B.Vahabzadə təhlükələrdən, təqiblərdən xilas ola bilmişdir. Birbaşa Sovet hakimiyyətini ifşa edən əsərlərini isə şair, Sovet İttifaqı dağılandan sonra ”Sandıqdan səslər” başlığı altında nəşr etdirmişdir.

B.Vahabzadə 70-dən artıq şeir kitabının, 2 monoqrafiyanın, 11 elmi-publisist kitabın və yüzlərlə məqalənin, eləcə də tarixi və müasir mövzuda 20-dən artıq irihəcmli poemanın müəllifidir. Şairin əsərləri - şeir kitabları, dramları və publisistik yazıları keçmiş Sovetlər Birliyi xalqlarının dillərinə,




eləcə də dünyanın bir çox dillərinə, - ingilis, fransız, alman, fars, türk, polyak, ispan, macar dillərinə tərcümə edilmişdir. B.Vahabzadə milli olduğu qədər də dünyəvi şairdir, bəşəri şairdir. O, Azərbaycandan dünyaya və dünyadan Azərbaycana baxmağı bacaran böyük sənətkar idi.

Dünya şöhrətli qırğız yazıçısı Çingiz Aytmatov Bəxtiyar Vahabzadənin Türk dünyasının, türkdilli ədəbiyyatın aparıcı simalarından biri olduğunu qeyd etmiş və onunla bağlı xatirələrində belə yazmışdır: “Dünyada ad çıxaran çox şair var. Qəzet və jurnalları vərəqlədikcə görürsən ki, əsl şair azdır. Təktənha qalanda, bir neçə kəlmə ilə “Həyat nədir” sualına cavab axtaranda yalnız sözü fikirdən, obrazdan, ruh və nəfəsdən yoğrulmuş həqiqi şairlər sənin yaşamaq eşqinə, düşüncələrinə qol-qanad verir. Müasirimiz Bəxtiyar Vahabzadə belə şairlərdəndir”.

B.Vahabzadə 2009-cu il fevral ayının 13-də, 83 yaşında uzun sürən xəstəlikdən sonra Bakıda vəfat etmişdir.

Məlumat üçün onu da qeyd edək ki, 2 gün davam edən konfransda Bakı Dövlət Universitetinin, Sumqayıt Dövlət Universitetinin, Bakı Slavyan Universitetinin, Təhsil Problemləri İnstitutunun, Qərb Universitetinin və digər ali təhsil müəssisələrinin alim və mütəxəssisləri iştirak ediblər. Plenar iclasda ADPU-nun Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov “Bəxtiyar Vahabzadə: düşündürən şair, həssas pedaqoq, dil və ədəbiyyat qayğıkeşi”, “Dədə Qorqud” Elmi-Tədqiqat Laboratoriyasının müdiri, professor Ramazan Qafarlı “Bəxtiyar Vahabzadə: sənəti və şəxsiyyəti”, Azərbaycan və dünya ədəbiyyatı tarixi kafedrasının professoru Təyyar Salamoğlu “Bəxtiyar Vahabzadə - milli istiqlal tariximizin salnaməçisi” mövzularında məruzə ilə çıxış ediblər. Məruzəçilər B.Vahabzadəni milli ruhlu, çoxşaxəli yaradıcılığa malik böyük yazıçı, həmişə ana dilimizin təəssübünü çəkən vətənpərvər ziyalı kimi səciyyələndiriblər. Plenar iclasda həm də Filologiya fakültəsi tələbələrinin hazırladıqları bədii kompozisiya təqdim edilib. Konfransın 5 bölmə üzrə keçirilən iclaslarında 80 məruzə dinlənilib.

**Gülnar SÜLEYMANOVA,**
**Könül NƏZƏROVA**

# ADPU-da “Televiziya proqramlarında Azərbaycan ədəbi dili: araşdırmalar, təhlil, rəy və təkliflər” mövzusunda respublika konfransı keçirilib

Noyabr ayının 23-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) “Azadlıq Hərəkatçıları” İctimai Birliyi ilə birlikdə “Televiziya proqramlarında Azərbaycan ədəbi dili: araşdırmalar, təhlil, rəy və təkliflər” mövzusunda respublika konfransı keçirilib. Konfransda ADPU-nun rəhbərliyi, professor-müəllim heyəti və tələbə-gəncləri, həmçinin tanınmış və nüfuzlu dilçi alimlər, televiziya aparıcıları iştirak ediblər.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif



Məmmədov konfransı giriş sözü ilə açaraq bildirib ki, bu gün universitetdə keçirdiyimiz konfrans mövzu baxımından çox aktualdır. Çünki dil hər bir xalqın milli varlığının ən mühüm göstəricisi, onun yaddaş xəritəsi, ümumi mədəni səviyyəsinin tərkib hissəsidir. Azərbaycan dili xalqımızın mənəvi sərvəti, dünya azərbaycanlılarının həmrəyliyinin sarsılmaz təməli, dövlətimizin müstəqilliyinin başlıca rəmzlərindən biridir. Bu dildə dünya ədəbiyyatı xəzinəsinə daxil olan misilsiz əsərlər yaradılmışdır. Azərbaycanın zaman-zaman müxtəlif imperiyalar tərkibində yaşamağa məcbur olmasına baxmayaraq, ana dilimiz hətta ən ağır vaxtlarda belə milli məfkurənin, milli şüurun və milli-mədəni dəyərlərin layiqincə yaşamasını və inkişafını təmin etmişdir. Bu gün ana dilimizin qorunması və qayğı ilə əhatə olunması ölkəmizin hər bir vətəndaşının müqəddəs borcudur.

Rektor Yusif Məmmədov qeyd edib ki, xalqımızın böyük vətənpərvər oğlu, ümummilli liderimiz Heydər Əliyev respublikamıza rəhbərlik etməyə başladığı ilk vaxtlardan Azərbaycan ədəbi dilinə ayrıca diqqət yetirmiş, dilimizin saflığının qorunması və inkişaf etməsi üçün səmərəli əməli fəaliyyət göstərmişdir. Məhz ulu öndər Heydər Əliyevin hazırlayıb həyata keçirdiyi dövlət quruculuğu strategiyasının tərkib hissəsi olan dil siyasətinin nəticəsidir ki, 1970-ci illərdə Azərbaycan dilinin tarixi intensiv şəkildə öyrənilmiş, müasir Azərbaycan dilinin problemləri ilə bağlı çoxsaylı elmi-nəzəri əsərlər yaradılmışdır. Ali məktəblər üçün yazılmış dördcildlik “Müasir Azərbaycan dili” dərsliyi 1974-cü ildə məhz Ulu Öndərin təşəbbüsü ilə milli dilçilik elminin inkişafına töhfə kimi qiymətləndirilərək respublikanın Dövlət mükafatına layiq görülmüşdür. Eyni zamanda ulu öndər Heydər Əliyev ana dilimizin dövlət dili statusu alması üçün böyük səylər göstərmiş, nəticədə 1978-ci ildə qəbul edilən Konstitusiyada Azərbaycan dilinin dövlət dili kimi xüsusi maddədə göstərilməsinə nail olmuşdur. Onu da qeyd edək ki, SSRİ Elmlər Akademiyasının yeganə “Türkologiya” jurnalı da məhz Bakıda nəşr edilirdi.

Azərbaycan XX əsrin sonlarında öz dövlət müstəqilliyini yenidən bərpa etdikdən sonra ana dilimiz xalqımızın ictimai-siyasi, sosial-iqtisadi və elmi-mədəni həyatında dövlətin rəsmi dili kimi müstəsna əhəmiyyət kəsb etməyə başlamışdır. Ümummilli liderimiz Heydər Əliyevin “Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında” 18 iyun 2001-ci il tarixli və “Azərbaycan Respublikasında dövlət dili haqqında” Azərbaycan Respublikası Qanununun tətbiq edilməsi barədə” 2 yanvar 2003-cü il tarixli fərmanları ilə ədəbi dilimizin fəaliyyət meydanı daha da genişlənmişdir.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev Azərbaycan dilinin inkişafına yüksək qayğı və diqqət göstərir. Ölkə Prezidenti 2012-ci il may ayının 23-də “Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı haqqında” Sərəncam imzalamışdır. Həmin Sərəncamda Azərbaycan Milli Elmlər Akademiyasının Təhsil Nazirliyi, Rabitə və Yüksək Texnologiyalar Nazirliyi, Mədəniyyət və Turizm Nazirliyi və digər aidiyyəti qurumlarla birlikdə Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramının layihəsini hazırlayıb 2012-ci il oktyabr ayının 1-dək Nazirlər Kabinetinə təqdim etmələri, Nazirlər Kabinetinin isə bu Sərəncamın 1-ci hissəsində nəzərdə tutulan Dövlət Proqramının layihəsini 2012-ci il noyabr ayının 1-dək Azərbaycan Respublikasının Prezidentinə təqdim etməsi öz əksini tapmışdır. Sərəncamda eyni zamanda Azərbaycan dilində termin yaradıcılığı sahəsində işlərin tənzimlənməsi və koordinasiya edilməsi üçün Nazirlər Kabineti yanında Terminologiya Komissiyasının yaradılması, həmçinin ölkəmizdə müxtəlif sahələrdə tərcümə işinin mərkəzləşdirilmiş qaydada və məqsədyönlü aparılması üçün Nazirlər Kabineti yanında Tərcümə Mərkəzinin yaradılması vəzifələri də qarşıya qoyulmuşdur.



Bununla yanaşı, Azərbaycan Prezidenti İlham Əliyev 2013-cü ilin aprel ayının 9-da “Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı”nın təsdiq edilməsi haqqında Sərəncam imzalamışdır. Həmin Sərəncama əsasən Dövlət Proqramının icrasına dair Tədbirlər Planı təsdiqlənmişdir. Qeyd edək ki, Dövlət Proqramının məqsədi Azərbaycan dilinin istifadəsinə və tədqiqinə dövlət qayğısının artırılmasını, Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsini, ölkədə dilçilik araşdırmalarının əsaslı surətdə yaxşılaşdırılmasını, dilçiliyin aparıcı istiqamətlərində fundamental və tətbiqi tədqiqatların inkişafına yönəldilmiş yaradıcılıq səylərinin birləşdirilməsini və dilçiliyin müasir cəmiyyətin aktual problemləri ilə əlaqələndirilməsini təmin etməkdir. Dövlət Proqramının əsas vəzifələri isə Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun inkişafı, qorunması, elektron məkanda daha geniş istifadəsi və ölkədə dilçiliyin inkişaf etdirilməsi mexanizminin yaradılması, dilçilik sahəsində yüksəkixtisaslı kadrların hazırlanmasının təkmilləşdirilməsi, dünya dilçilik elminin müasir inkişaf meyillərini nəzərə almaqla, elmi tədqiqatların prioritet istiqamətlərinin müəyyənləşdirilməsi, dilçilik sahəsində dünyanın aparıcı elmi mərkəzləri ilə əməkdaşlığın inkişaf etdirilməsi, dilin inkişafı və tədrisi məsələlərinin uzlaşdırılması və təkmilləşdirilməsi, dilçi alimlərin müasir informasiya-kommunikasiya texnologiyalarının yaradılmasında iştirakının təmin edilməsi, dil və mədəniyyət tarixinin daha əsaslı tədqiqini təmin etmək üçün qədim dillərin tarixinin öyrənilməsi, dilin inkişafı və ədəbi dil normalarının qorunmasını təmin edən qanunvericilik bazasının təkmilləşdirilməsi, dil və nitq mədəniyyətinin yüksəldilməsi, dilimizin lüğət tərkibinin və qrammatik normalarının sistemləşdirilməsi, Azərbaycanda dil situasiyalarının və dil əlaqələrinin öyrənilməsi və digər məsələlər daxildir. Ötən müddət ərzində bu sahədə xeyli işlər görülmüşdür. Nazirlər Kabineti yanında Terminologiya Komissiyası və Tərcümə Mərkəzi yaradılmış, yeni orfoqrafiya lüğəti hazırlanıb çap edilmişdir.

Rektor Y.Məmmədov çıxışının bu məqamında deyib: “Dövlət başçımız İlham Əliyev noyabr ayının 9-da Azərbaycan Milli Elmlər Akademiyasının 70 illik yubileyinə həsr olunmuş ümumi yığıncağındakı dərin məzmunlu nitqində demişdir: “Dilimiz o qədər zəngindir ki, heç bir xarici kəlməyə ehtiyac yoxdur. Azərbaycan dili bizi bir xalq, millət kimi qoruyub. Əsrlər boyu biz başqa ölkələrin, imperiyaların tərkibində yaşadığımız, müstəqil olmadığımız dövrdə milli dəyərlərimizi, ana dilimizi qoruya, saxlaya bilmişik. Azərbaycan dilinin saflığını qoruya bilmişik. Ona görə bu gün bəzi hallarda görəndə ki, dilimizə xaricdən müdaxilələr edilir və bəzi hallarda bu müdaxilələr Azərbaycanda dəstək qazanır, bu məni, doğrudan da, çox narahat edir. Azərbaycan dili o qədər zəngindir ki, heç bir xarici kəlməyə ehtiyac yoxdur. Bir daha demək istəyirəm ki, biz əsrlər boyu dilimizi qorumuşuq. Bu gün də qorumalıyıq. Biz Azərbaycan dilinin saflığını təmin etməliyik. Əlbəttə, bizim vətəndaşlar, xüsusilə gənc nəsil nə qədər çox xarici dil bilsə, o qədər yaxşıdır. Ancaq ilk növbədə, öz ana dilini bilməlidirlər. Digər tərəfdən, imkan verməməlidirlər ki, ana dilimizə yad kəlmələr daxil olsun. Buna ehtiyac yoxdur. Ancaq biz bunu görürük. Bəzi ictimai xadimlərin, hökumət üzvlərinin çıxışlarında, bəzi televiziya verilişlərində, Milli Məclisdə eşidirik ki, kənar kəlmələrdən istifadə edilir. Buna ehtiyac yoxdur. Əlbəttə, mən bu sahə üzrə mütəxəssis deyiləm, ancaq bir vətəndaş kimi hesab edirəm ki, yeni kəlmələrin icad edilməsinə heç bir ehtiyac yoxdur. Lüğətimiz o qədər zəngindir ki, bunu qorusaq və gələcək nəsillərə əmanət kimi təhvil versək bu, bizim bu sahədəki ən böyük nailiyyətimiz olacaq”.

“Azadlıq Hərəkatçıları” İctimai Birliyinin sədri, yazıçı-publisist Təhmasib Novruzov çıxış edərək bildirib ki, qloballaşan müasir dünyamızda çox əfsuslar olsun ki, Azərbaycan dilinin təmizliyinə və inkişafına xələl gətirən məqamlarla qarşılaşmalı oluruq. Xüsusilə də, televiziya proqramlarında ədəbi dil normalarının pozulması, yerli-yersiz əcnə-

(Davamı 4-cü səhifədə)

# ADPU-da “Televiziya proqramlarında Azərbaycan ədəbi dili: araşdırmalar, təhlil, rəy və təkliflər” mövzusunda respublika konfransı keçirilib

(Əvvəli 3-cü səhifədə)

bi sözlərdən istifadə olunması, bəzən aparıcıların dialekt və şivvələrdən istifadə etmələri,orfoepiya qaydalarını kobud şəkildə pozmaları daha çox müşahidə olunur. Bu gün hər bir azərbaycan ziyalısı bunu hiss edir və bu mənfi hala öz etirazını bildirir. Məhz bu məqsədlə “Azadlıq Hərəkatçıları” İctimai Birliyi Azərbaycan Respublikasının Prezidenti yanında Qeyri -Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurasının maliyyə dəstəyi ilə bu ilin aprel-noyabr aylarında “Televiziya proqramlarında Azərbaycan ədəbi dili: araşdırmalar, təhlil, rəy və təkliflər” layihəsini uğurla həyata keçirmiş, ciddi nəticələr əldə etmişdir. Layihənin icrası zamanı AMEA-nın Dilçilik İnstitutunun, eləcə də ali məktəblərin dilçilik kafedralarının alim-mütəxəssisləri ilə birgə araşdırma və təhlillər aparılmış, rəy və təkliflər hazırlanmış, aşkar olunan qüsurların videogörüntüləri, həmçinin layihə çərçivəsində hazırlanmış “Televiziya və Azərbaycan ədəbi dili” sənədli filmi televiziya kanallarına və Milli Teleradio Şurasına təqdim edilmişdir. Qeyd edək ki, layihənin icrası zamanı 765 qüsur aşkar edilib. Layihənin həyata keçirilməsi zamanı Azərbaycanın tanınmış dilçi alim və teleaparıcılarından ibarət 11 nəfərlik Münsiflər Heyəti yaradılmışdır. ADPU-da layihənin yekunlarına həsr edilmiş konfransın keçirilməsi də bu istiqamətdə atılan mühüm bir addımdır.

Konfransda “Səs” TV-nin istehsalı olan “Televiziya və Azərbaycan ədəbi dili” sənədli filmi nümayiş etdirilib. Tədbirdə Milli Teleradio Şurasının sədr müavini Qafar Cəbiyev, məşhur diktorlardan Xalq artisti Sabir Ələsgərov, Xalq artisti Ofeliya Sənani, Əməkdar artist Natəvan Hacıyeva, Şəfəq Əlixanlı, Əməkdar artist Eldost Bayram, ADPU-nun Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov, AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun professoru Qulu Məhərrəmli və digərləri çıxış edərək mətbuat və televiziyada ədəbi dilin normalarının qorunmasının vacibliyini bildirmiş və bu mühüm işdə bütün cəmiyyətin birgə səy göstərməsinin vacibliyini qeyd etmişlər.

Konfransın sonunda layihə çərçivəsində keçirilmiş müsabiqənin nəticələri elan olunmuşdur. Münsiflər Heyətinin qərarına əsasən 7 nəfər televiziya aparıcısı ədəbi dil normalarına daha ciddi əməl etdiklərinə görə “Ən natiq teleaparıcı” mükafatına layiq görülmüş, eyni zamanda dil qüsurlarına daha çox yol verən 7 nəfər teleaparıcının adı ictimaiyyətə açıqlanmışdır.

**Mətbuat və informasiya şöbəsi**

# ADPU-da görüş

Noyabr ayının 24-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Misir Ərəb Respublikasının Azərbaycandakı səfirliyinin nəzdində fəaliyyət göstərən Misir Mədəniyyət Mərkəzinin müdiri cənab Əhməd Sami Elaydy ilə görüş keçirilib. ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov qonağı salamlayaraq bu görüşün keçirilməsindən razı qaldığını bildirib. Görüş zamanı rektor Yusif Məmmədov rəhbərlik etdiyi universitetin yaranma tarixi, keçdiyi böyük inkişaf yolu və bugünkü fəaliyyəti, tədris prosesi, beynəlxalq əlaqələri barədə ətraflı məlumat verib. Rektor Y.Məmmədov qeyd edib ki, ADPU fəaliyyət göstərdiyi müddət ərzində elm və təhsilimizin inkişafına böyük töhfələr verib. Xalqımızın böyük oğlu, ulu öndərimiz Heydər Əliyev həmişə ADPU-ya yüksək qayğı və diqqət göstərib. Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev də ADPU-ya xüsusi qayğı və diqqət göstərir.

ADPU-nun beynəlxalq əlaqələri barədə ətraflı məlumat verən rektor Y.Məmmədov bildirb ki, son illər universitetin beynəlxalq əlaqələri xeyli genişlənib və keyfiyyətcə yeni mərhələyə daxil olub. Belə ki, ADPU bu gün Türkiyənin Hacəttəpə Universiteti, Ankara Universiteti, Mehmet Akif Ersoy Universiteti, Qazi Universiteti, Muğla Sıtkı Koçman Universiteti, Balıkesir Universiteti, Şimali Kipr Türk Cümhuriyyətinin Yaxın Doğu Universiteti, Rumıniyanın, eləcə də Avropanın çox nüfuzlu Babeş-Bolyai Universiteti, Fransanın Strasburq Universiteti, Dağıstan Dövlət Pedaqoji Universiteti, Qazaxıstanın Abay adına Milli Pedaqoji Universiteti, Tacikistanın Kulyab Universiteti, Tatarıstan Dövlət Humanitar Universiteti, habelə Rusiyanın digər qabaqcıl universitetləri və Baltikyanı ölkələrin bir sıra tanınmış universitetləri ilə elm və təhsil sahəsində səmərəli əməkdaşlıq edir. Bütövlükdə isə ADPU son illər 11 ölkənin 23 universiteti ilə əməkdaşlıq haqqında müqavilə imzalayıb. Bunlarla yanaşı, ENOTES (European Computer Driving License National Operator and Test Centers in Azerbaijan) layihəsinə qoşulmaq üçün ADPU ilə Qafqaz Universiteti arasında mandat imzalanıb. Bu layihəyə əsasən universitetdə ECDL Milli Test Mərkəzi quraşdırılıb. Eyni zamanda ADPU-nun professor-müəllimləri dünyanın bir çox ölkələrində keçirilən yüksək səviyyəli beynəlxalq elmi konfranslarda, simpoziumlarda, konqreslərdə, həmçinin çoxsaylı layihə və proqramlarda fəal iştirak edirlər.



Misir Mədəniyyət Mərkəzinin müdiri Əhməd Sami Elaydy da öz növbəsində ölkəsinin zəngin tarixi, mədəniyyəti və müasir vəziyyəti barədə geniş məlumat verib. O, eyni zamanda ölkəmizdə ali pedaqoji təhsilin öncülü sayılan ADPU-da görüş keçirməsindən məmnun qaldığını ifadə edib, universitetin rəhbərliyinə, professor-müəllim heyətinə və tələbə kollektivinə uğurlar arzulayıb. Səmimi keçən görüşdə Misir Mədəniyyət Mərkəzinin mühüm fəaliyyətinin iki ölkə arasında təhsil, mədəniyyət sahələrində əhəmiyyətli rolu haqqında fikir mübadiləsi aparılıb.

Görüşdə ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru, dosent Mehdi Abdullayev və Ümumi işlər üzrə prorektoru Əbdül Xalıqov iştirak ediblər.

**Mətbuat və informasiya şöbəsi**

# 14 Noyabr - Ümumdünya Diabet Günü qeyd olunub

Statistik göstəricələrə görə, dünya üzrə hər 10 saniyədə 2 nəfərə şəkərli diabet diaqnozu qoyulur, 1 nəfər isə bu xəstəlikdən dünyasını dəyişir. Dünyada şəkərli diabetə düçar olmuş insanların sayı 300 milyona yaxındır. Xəstəliyin geniş miqyasda artımı əhalinin sağlamlığının ümumi səviyyəsini azaldır. Ümumdünya Səhiyyə Təşkilatı (ÜST) şəkərli diabetin yayılma sürətinə görə onu qeyri-infeksion epidemiya kimi dəyərləndirir. Əgər bu probleme düzgün yanaşılmasa, 2035-ci ildə təxminən 600 milyon insanda şəkərli diabet aşkar oluna bilər. Birləşmiş Millətlər (BMT) Təşkilatının Baş Assambleyasının 20 dekabr 2006-cı il tarixli 61/225 nömrəli qətnaməsində bildirilir: “Şəkərli diabet xroniki, üzücü, böyük xərclər tələb edən, ağır xroniki fəsadlarla müşayiət edilən xəstəlikdir, hansı ki, ailəyə, üzv dövlətlərə, bütün dünyaya böyük təhlükə yaradır və beynəlxalq səviyyədə inkişaf məqsədlərinə ciddi maneçilik törədir”.





Göstərilən statistik məlumatlar bizi sağlamlıqla bağlı problemlərə qarşı daha həssas və diqqətli olmağa vadar edir. Qeyd etmək lazımdır ki, respublikamızda şəkərli diabetin qarşısını almaq məqsədilə mütəmadi olaraq lazımi işlər görülür. Dövlətimiz şəkərli diabet xəstəliyindən əziyyət çəkən insanlara xüsusi diqqət göstərir. Belə ki, “Şəkərli diabet xəstəliyinə tutulmuş şəxslərə dövlət qayğısı haqqında” Qanununun tətbiq edilməsi barədə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 2004-cü il 12 fevral tarixli Fərmanına uyğun olaraq Nazirlər Kabinetinin 2005-ci il 7 iyun tarixli 101 nömrəli qərarı ilə “2005-2009-cu illər üzrə “Şəkərli diabet üzrə Dövlət Proqramı” təsdiq edilmişdir. Növbəti illər üzrə isə Nazirlər Kabinetinin 2010-ci il 26 noyabr tarixli 222 nömrəli qərarı ilə “2011-2015-ci illər üçün Şəkərli Diabet üzrə Tədbirlər Proqramı” təsdiq edilmişdir.



Şəkərli diabet xəstəliyi bizim müdaxiləmizi tələb edən mühüm problemlərdən biridir və onun aradan qaldırılmasında, xəstəliyin inkişafının qarşısının alınmasında dövlət və qeyri-dövlət təşkilatlarının birgə səylərinin göstərilməsi vacibdir. Məhz elə bu səbəbdən Azərbaycan Qızıl Aypara Cəmiyyəti (AQAC) artıq ənənəvi olaraq ona daimi dəstək verən və tərəfdaş olan Səhiyyə Nazirliyinin İctimai Səhiyyə və İslahatlar Mərkəzi (İSİM), Azərbaycan Diabet Liqası (ADL) və digər təşkilatlarla birlikdə bu xəstəlik haqqında ictimaiyyətin geniş məlumatlandırılması və eyni zamanda 14 Noyabr -Ümumdünya Diabet Gününün qeyd olunması üçün lazımi tədbirləri həyata keçirir. 14 Noyabr-Ümumdünya Diabet Günü bəşəriyyətin diqqətini şəkərli diabetlə bağlı problemlərə yönəltmək məqsədilə Ümumdünya Səhiyyə Təşkilatının və Beynəlxalq Diabet Federasiyasının tövsiyələrinə görə 1991-ci ildən qeyd olunur. Bu gün eyni zamanda böyük həkim, alim, Nobel mükafatı laureatı, insulini kəşf edən Frederik Bantınqın anadan olduğu gündür. 2007-ci ildən isə 14 Noyabr -Ümumdünya Diabet Günü BMT günü elan edilərək bu təşkilata üzv olan dövlətlərdə xüsusi qeyd edilir.

Bu mövzuda planlaşdırılan növbəti tədbirlərdən biri də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) professor-müəllim heyəti və tələbə kollektivi ilə keçirilən görüş idi. ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev görüşü giriş sözü ilə açaraq keçirilən tədbirin mahiyyət və məqsədi barədə məlumat verib. AQAC-ın, ADL və İSİM-in əməkdaşları da öz növbələrində ADPU-nun rəhbərliyinə belə bir görüşün keçirilməsinə görə dərin təşəkkürlərini bildiriblər. Onlar həmçinin AQAC-ın ADPU Bölməsinin sədri, professor Jalə Qədimovaya AQAC-ın işində fəal iştirak etdiyinə görə minnətdarlıqlarını ifadə ediblər.

Tədbir zamanı iştirakçılara 14 Noyabr-Ümumdünya Diabet Günü və ümumiyyətlə, şəkərli diabet mövzusu ilə bağlı ətraflı məlumatlar verilib. Şəkərli diabetin tipləri, əmələ gəlməsinin səbəbləri, müalicəsi, düzgün qidalanmanın və fəal həyat tərzinin şəkərli diabet xəstəliyinin profilaktikasında rolu və s.edilən məruzələrin leytmotivini təşkil edib. Məruzələrin sonunda tədbir iştirakçılarının suallar cavablandırılıb.

Tədbirin sonunda iştirakçılara şəkərli diabet mövzusunda və “Medtronic” kampaniyasının şəkərli diabet xəstəliyindən əziyyət çəkən insanlar üçün istehsal etdikləri yeniliklər haqqında videoçarx nümayiş olunub.

**Könül NƏRİMANQIZI**

# “Yeni ekoloji mədəniyyətin formalaşdırılması” mövzusunda maarifləndirici seminar

Noyabr ayının 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kiçik akt zalında “Yeni ekoloji mədəniyyətin formalaşdırılması” mövzusunda maarifləndirici seminar keçirilib. “Təmiz şəhər” Açıq Səhmdar Cəmiyyətinin (ASC) təşkilatçılığı ilə keçirilən seminarda ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev, Biologiya fakültəsinin dekanı, professor Yusif Əhmədov, “Təmiz şəhər” ASC-nin Ekologiya Departamentinin rəhbəri Sabit Zeyniyev, “Təbiət və həyat” qeyri-hökumət təşkilatının rəhbəri Fuad Axundzadə, “Eko və səma” İctimai Birliyinin rəhbəri İradə Həsənova, “Milli Ekoloji Proqnozlaşdırma Mərkəzi”nin prezidenti, texniki elmlər doktoru Telman Zeynalov iştirak ediblər.

ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev seminarı giriş sözü ilə açaraq belə tədbirlərin tələbə-gənclərin maarifləndirilməsi baxımından səmərəli olduğunu bildirib. Çünki bəşəriyyətin müasir yaşayışını ekologiyasız təsəvvür etmək mümkün deyildir.

Seminarda çıxış edən professor Yusif Əhmədov, Sabit Zeyniyev, Fuad Axundzadə, İradə Həsənova, Telman Zeynalov təbiətin-hava, su, torpaq, heyvan və bitki aləminin, faydalı qazıntıların və s. mühafizəsi, təbii sərvətlərdən istifadə olunmasının qanunauyğunluqları və digər ekoloji məsələlər barədə danışıblar. Çıxış edənlər gənclərə ekoloji mədəniyyətə yiyələnməyi tövsiyə ediblər. Qeyd edilib ki, son illər həm Azərbaycan dilində, həm də xarici dillərdə ekologiya ilə bağlı çoxlu dərslik, dərs vəsaiti və digər elmi kitablar nəşr edilir, təbiətlə insanın əlaqəsini əks etdirən qəzetlər, jurnallar buraxılır, kütləvi informasiya vasitələri bu sahədə hərtərəfli təbliğat aparırlar. Hərtərəfli inkişaf etmək istəyən tələbə-gənclər ekoloji biliklərə dair müvafiq mənbələri ardıcıl izləməli, bu sahədə öz biliklərini artırmalıdırlar. Bu, həm də onların ekoloji təfəkkürünün formalaşmasına kömək edə bilər.

Seminarda həmçinin məişət tullantılarından səmərəli istifadə edilməsi, gənclərin bərk məişət tullantıları ilə davranış qaydalarına riayət etmələri ilə bağlı maraqlı çıxışlar edilib.

Seminarda tələbə-gənclərin mövzu ilə bağlı müxtəlif sualları cavablandırılıb.

**“Gənc müəllim”**

# ADPU-da "Türk epos düşüncəsi yazılı mənbələrdə" mövzusunda Respublika elmi konfransı keçirilib

**Noyabr ayının 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Kitabi-Dədə Qorqud" un alman dilində ilk tərcüməsi və nəşrinin 200 illik yubileyinə həsr olunmuş "Türk epos düşüncəsi yazılı mənbələrdə" mövzusunda Respublika elmi konfransı keçirilib. Qeyd edək ki, konfransdan öncə universitetdə "Kitabi-Dədə Qorqud" dastanının tarixini, dastanın xüsusiyyətlərini, bu mövzuda aparılan tədqiqatları və görülmüş işləri əks etdirən əsərlərdən ibarət sərgi nümayiş etdirilib.**

Konfransı giriş sözü ilə ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev açıb. Professor Vilayət Əliyev bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev bu il fevral ayının 20-də milli-mədəni irsin qorunub yaşadılması və yeni nəsillərin azərbaycançılıq ruhunda tərbiyə olunmasında "Dədə Qorqud" dastanlarının böyük əhəmiyyətini nəzərə alaraq, qorqudşünaslığın sistemli fəaliyyətinin təmin edilməsi məqsədi ilə "Kitabi-Dədə Qorqud"un alman dilində ilk tərcüməsi və nəşrinin 200 illiyinin qeyd edilməsi haqqında 1059 nömrəli Sərəncam imzalamışdır. Həmin Sərəncamda qeyd edilir ki, 2015-ci ildə Azərbaycan xalqının mədəni sərvətlər xəzinəsində müstəsna yer tutan və əsrlərdən bəri milli-mənəvi varlığın ayrılmaz tərkib hissəsinə çevrilən "Kitabi-Dədə Qorqud" abidəsinin alman şərqşünas alimi Fridrix fon Dits tərəfindən üzə çıxarılması, nəşr edilməsi və dünya elm aləminə tanıdılmasının 200 illiyi tamam olur. Böyük mənəvi və siyasi əhəmiyyət daşıyan Sərəncamda o da vurğulanır ki, ötən müddət ərzində "Dədə Qorqud" dastanları ilə bağlı çox sayda araşdırmalar aparılmış və qorqudşünaslığın ayrıca sahə kimi formalaşdırılması istiqamətində mühüm addımlar atılmışdır. 2000-ci ildə "Kitabi-Dədə Qorqud"un 1300 illik yubileyinin UNESKO xətti ilə beynəlxalq səviyyədə təntənəli şəkildə qeyd edilməsi abidənin tədqiqi tarixində yeni mərhələnin başlanğıcı olmuşdur. Sərəncamda Mədəniyyət və Turizm Nazirliyinin Təhsil Nazirliyi və Azərbaycan Milli Elmlər Akademiyası ilə birlikdə, Bakı Beynəlxalq Multikulturalizm Mərkəzinin, Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun və Azərbaycan Yazıçılar Birliyinin təkliflərini nəzərə almaqla, "Kitabi-Dədə Qorqud"un alman alimi Fridrix fon Dits tərəfindən ilk tərcüməsi, nəşri və dünya elm aləminə tanıdılmasının 200 illiyinə dair fəaliyyət proqramını hazırlayaraq təsdiq olunmaq üçün Nazirlər Kabinetinə təqdim etmələri və Nazirlər Kabinetinin bu Sərəncamdan irəli gələn məsələləri həll etməsi öz əksini tapmışdır. Təhsil naziri hörmətli cənab Mikayıl Cabbarov da bu il aprel ayının 1-də bu barədə 346 nömrəli əmr imzalamışdır. Bizim bu gün keçirdiyimiz respublika elmi konfransı da yuxarıda qeyd etdiyim Sərəncama və əmrə uyğun olaraq keçirilən bir elmi tədbirdir. Onu da qeyd etmək istəyirəm ki, həmin Sərəncam və əmrin icrasını təmin etmək məqsədilə bu il oktyabr ayının 10-da universitetdaxili əmr imzalanmış və hazırlanmış tədbirlər planı təsdiq olunmuşdur. Tədbirlərin hazırlanması və keçirilməsi üçün universitetdə ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun sədrliyi ilə 15 nəfərdən ibarət Təşkilat Komitəsi yaradılmışdır. Qeyd etdiklərimdən əlavə, ADPU-nun filoloq və tarixçi alimlərinin "Kitabi-Dədə Qorqud"un alman dilində ilk tərcüməsi və nəşrinin 200 illik yubileyi ilə bağlı ölkə mətbuatında çoxsaylı yazıları dərc edilmişdir.





Xalqımızın dahi oğlu, müstəqil dövlətimizin memarı və qurucusu, ümummilli liderimiz Heydər Əliyev həmişə xalqımızın qədim və böyük tarixinə, zəngin mədəni irsinə, adət-ənənələrinə, yüksək milli-mənəvi dəyərlərinə, söz hikməti xəzinəsinə yüksək qiymət vermiş, bu dəyərlərin qorunması, yaşadılması və gənc nəslə çatdırılması üçün məqsədyönlü fəaliyyət həyata keçirmişdir. Bu baxımdan, ulu öndər Heydər Əliyevin bütün Türk dünyasının həmişəyaşar abidəsi sayılan "Kitabi - Dədə Qorqud" eposuna göstərdiyi qayğı və diqqəti xüsusi qeyd etmək istəyirəm. Dahi milli liderimiz Heydər Əliyev 1997-ci il aprel ayının 20-də "Kitabi-Dədə Qorqud" dastanının 1300 illik yubileyi haqqında" Fərman, 1999-cu il fevral ayının 21-də isə "Kitabi-Dədə Qorqud" dastanının 1300 illik yubileyi üzrə Dövlət Komissiyasının tədbirlər planı haqqında" Sərəncam imzalamışdır. Ulu Öndərimizin bu Fərman və Sərəncamı tarixi irsin qorunub saxlanmasında və yeni nəsillərin azərbaycançılıq ruhunda tərbiyə olunmasında əvəzsiz rol oynamışdır. Bu Fərman və Sərəncamın verilməsi nəticəsində respublikamızda və bir çox xarici ölkələrdə çoxsaylı tədbirlər keçirildi, yeni nəşrlər meydana gəldi. "Kitabi-Dədə Qorqud" ensiklopediyası, məqalələr çap olundu, oxucular üçün sadələşdirilmiş variantı işıq üzü gördü. Rəsm əsərləri çəkildi, şeirlər yazıldı. 2000-ci ildə "Kitabi-Dədə Qorqud"un 1300 illik yubileyinin UNESKO xətti ilə beynəlxalq səviyyədə təntənəli qeyd edilməsi Türk dünyasının bu möhtəşəm abidəsinin tədqiqatı tarixində yeni mərhələnin başlanğıcı olmuşdur.

Dövlət başçımız cənab İlham Əliyev də "Kitabi-Dədə Qorqud" dastanına xüsusi qayğı və diqqət göstərir. Son illər Bakıda Dədə Qorqud parkı salınıb, Dədə Qorqud abidəsi ucaldılıb, eyni zamanda dastanın motivləri əsasında çoxseriyalı filmin çəkilişi nəzərdə tutulur. Ölkə Prezidentinin böyük alman şərqşünası Fridrix fon Dits tərəfindən "Kitabi-Dədə Qorqud"un elm aləminə tanıdılmasının 200 illiyinin qeyd edilməsi haqqında imzaladığı Sərəncam da milli-mədəni irsin qorunub yaşadılması və yeni nəsillərin milli ruhda tərbiyə olunmasına yönələn qayğının əyani ifadəsidir. Bu Sərəncam həm də Azərbaycanda, eləcə də bütün Türk dünyasında milli düşüncənin, soy-kökə bağlılığın güclənməsinə göstərilən qayğının bariz nümunəsidir. Sərəncam eyni zamanda azərbaycançılığın və türkçülüyün beynəlxalq aləmdə daha geniş miqyasda tanıdılmasına, təbliğ olunmasına xidmət edir.

Professor V.Əliyev qeyd edib ki, "Kitabi-Dədə Qorqud" Türk dünyasının çox qiymətli abidəsidir. Qərb dastanlarında salnaməçiliyə, Şərq dastanlarında isə poetikaya, şeirə meyil güclüdür. "Kitabi-Dədə Qorqud" mükəmməl nəzm və nəsrin vəhdətindən yaranan abidədir, burada mənsub oldugu xalqın böyük idealları əks olunmuşdur. Türk dünyasının böyük qorqudşünas alimləri Məmmədhüseyn Təhmasib, Əli Sultanlı, Həmid Araslı, Fuad Körpülü, Məhərrəm Ergin, Şamil Cəmşidov, Səfərəli Babayev və digərləri "Kitabi-Dədə Qorqud" la bağlı mükəmməl tədqiqatlar aparmış, mühüm elmi nəticələrə nail olmuşlar.

Konfransın plenar iclasında ADPU-nun Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov "Kitabi-Dədə Qorqud: yaddaş tariximizin dünəni və bu günü" , "Dədə Qorqud" Elmi-tədqiqat laboratoriyasının müdiri, professor Ramazan Qafarlı "Türk epos ənənəsi və Kitabi-Dədə Qorqud", Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının müdiri, professor Əzizxan Tanrıverdiyev "Dədə Qorqud Kitabı azərbaycan dilindədir" mövzularında məruzə ilə çıxış ediblər. Məruzəçilər "Kitabi-Dədə Qorqud"dastanını xalqımızın, eləcə də bütün Türk xalqlarının tarixini, mədəniyyətini dolğun əks etdirən bir əsər, böyük mənəviyyat kitabı və eyni zamanda Türk epos düşüncəsinin zirvəsi kimi səciyyələndiriblər.

İki gün davam edən konfransda Türkiyə Respublikasının Qazi Universitetinin, Ukrayna Respublikasının Taras Şevçenko adına Kiyev Milli Universitetinin, Bakı Dövlət Universitetinin, Azərbaycan Tibb Universitetinin, Gəncə Dövlət Universitetinin, Sumqayıt Dövlət Universitetinin, Azərbaycan Dillər Universitetinin, Bakı Slavyan Universitetinin, Azərbaycan Texnologiya Universitetinin, Azərbaycan Müəllimlər İnstitutunun, AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun, Nizami adına Ədəbiyyat İnstitutunun, Ziya Bünyadov adına Şərqşünaslıq İnstitutunun, Abasqulu Ağa Bakıxanov adına Tarix İnstitutunun, Füzuli adına Əlyazmalar İnstitutunun, Folklor İnstitutunun, AMEA-nın Müasir İnnovasiyalar Liseyinin, Azərbaycan Respublikasının Təhsil Problemləri İnstitutunun, Odlar Yurdu Universitetinin, Qərb Universitetinin alim və mütəxəssisləri, həmçinin AMEA-nın Hüseyn Cavid Ev-Muzeyinin, Texniki-Humanitar Liseyin, Ağdam Rayon İcra Hakimiyyətinin və Bakı şəhər 35 nömrəli tam orta məktəbin nümayəndələri iştirak ediblər.

Qeyd edək ki, konfransın 5 bölmə üzrə keçirilən iclaslarında 96 məruzə dinlənilib. Konfransda fərqlənənlərə sertifikatlar təqdim edilib.

**Mənsur İBRAHİMLİ,**
**Gülnar SÜLEYMANOVA**

# 12 Noyabr - Konstitusiya Günüdür

Hamımıza məlum olduğu kimi, bu il noyabr ayının 12-də Azərbaycan Respublikası Konstitusiyasının qəbul edilməsinin 20 ili tamam oldu. 1995-ci il noyabrın 12-də xalqımız referendum (ümumxalq səsverməsi) yolu ilə öz dövlətinin Əsas Qanununu-Konstitusiyasını qəbul etdi. Qeyd edək ki, yeni Konstitusiya 1995-ci il noyabrın 27-də qüvvəyə minmişdir. Bu Konstitusiya müstəqilliyini bərpa etmiş Azərbaycan dövlətinin ilk milli konstitusiyasıdır. Yeni Konstitusiya ölkədə demokratik, hüquqi, dünyəvi və unitar dövlət qurulması işinə hüquqi zəmin yaratdı.

"Konstitusiya" latın sözü olub "quruluş", "təsisat" mənasını verir. Dövlətin ali hüquqi qüvvəyə malik olan əsas qanunlar məcəlləsi belə adlanır.

Azərbaycan Xalq Cümhuriyyəti Konstitusiya qəbul etməsə də, Milli Şurada qəbul edilmiş "İstiqlaliyyət Bəyannaməsi" onu əvəz edirdi. Azərbaycanda Sovet hakimiyyəti qurulduqdan sonra ölkəmizin ictimai və dövlət quruluşunda mövcud olmuş qaydalar dəyişdirildi və Sovet rejiminin formalaşmasına başlandı. Sovetləşmə başa çatdıqdan sonra 1921-ci il mayın 19-da Bakıda keçirilən Azərbaycan SSR-in Birinci Sovetlər qurultayı Azərbaycan SSR-in birinci Konstitusiyasını qəbul etdi. Əsasən RSFSR Konstitusiyasının təkrarı olan bu Konstitusiya xalqa geniş hüquqlar vəd etsə də, əslində, formal səciyyə daşıyırdı.




Çünki Sovetlərin fəaliyyətinə bütün mərhələlərdə Moskvadan Rusiya Kommunist Partiyası tərəfindən istiqamətləndirilən Azərbaycan Kommunist Partiyası rəhbərlik edirdi. Üstəlik, ölkədə fəaliyyət göstərən bütün siyasi partiyalar qadağan olunmuş, bununla da Kommunist Partiyasının diktaturası yaranmışdı. Sovetlər bu partiyanın itaətkar alətinə çevrilmişdi.

Beləliklə, bolşeviklərin qanlı qırğınlarla müşayiət olunan zorakı tədbirləri nəticəsində Şimali Azərbaycanda guya Konstitusiyaya əsaslanan hakimiyyət orqanları formalaşdırıldı. Sovet sosialist demokratiyası bərqərar oldu. Əslində isə, Azərbaycan Xalq Cümhuriyyəti və onun parlamenti ilə müqayisədə yeni yaradılan demokratiya formal və yalançı demokratiya idi.

1937-ci il martın 14-də IX fövqəladə Azərbaycan Sovetlər qurultayı Azərbaycan SSR-in ikinci Konstitusiyasını təsdiq etdi. Bu Konstitusiya 1936-cı ildə qəbul edilmiş SSRİ Konstitusiyasının təkrarı idi.

Azərbaycan SSR-in sonuncu Konstitusiyası 1978-ci il aprelin 21-də qəbul edildi. Bu Konstitusiyanın 73-cü maddəsinə görə, Azərbaycan SSR-in dövlət dili Azərbaycan dili idi. Bu, o dövr üçün çox cəsarətli addım idi, çünki SSRİ-nin milli siyasətinin şovinist zəmində qurulduğu bir dövrdə respublikanın ali qanununa belə bir maddənin daxil edilməsi Sovet milli siyasətinin tələblərinə uyğun deyildi.

Bu çətin vəzifənin öhdəsindən o zamanlar Azərbaycana rəhbərlik edən ulu öndər Heydər Əliyev gəldi.

1991-ci il oktyabrın 18-də "Azərbaycan Respublikasının dövlət müstəqilliyi haqqında Konstitusiya Aktı" qəbul edildi. Bu sənədə görə Azərbaycan Respublikası Azərbaycan Xalq Cümhuriyyətinin varisi elan olunurdu. SSRİ-nin təşkili haqqında 1922-ci il 30 dekabr tarixli müqavilənin Azərbaycana aid hissəsinin imzalandığı andan etibarsız olduğu göstərilirdi.

Müstəqil Azərbaycan Respublikasının ilk Konstitusiyasının layihəsini hazırlamaq üçün ulu öndər Heydər Əliyevin sədrliyi ilə 33 nəfərdən ibarət Dövlət Komissiyası yaradılmışdı.

Əsas Qanunda dövlətin müstəqilliyini, suverenliyini və ərazi bütövlüyünü qorumaq, cəmiyyətin demokratikləşdirilməsinə və vətəndaş cəmiyyətinin bərqərar olmasına nail olmaq, qanunların aliliyini təmin edən hüquqi, dünyəvi dövlət qurmaq, bazar iqtisadiyyatı münasibətlərinin formalaşmasını təmin etmək və s. kimi dünyəvi prinsiplər təsbit olunmuşdur. Konstitusiyada insan və vətəndaş hüquq və azadlıqlarına geniş yer verilmişdir. Belə ki, Konstitusiyanın 158 maddəsindən 48-i insan hüquq və azadlıqlarına və onların təminatlarına həsr edilmişdir.

Konstitusiyanın 24-cü maddəsinin 1-ci hissəsində deyilir: "Hər kəsin doğulduğu andan toxunulmaz, pozulmaz və ayrılmaz hüquqları və azadlıqları vardır". Azadlıq - digərlərinə zərər yetirməyən hər şeyi etmək imkanıdır. Azadlığın sərhədləri yalnız qanunla müəyyənləşdirilə bilər. Qanun insan hüquqlarını istənilən pozuntudan qorumağa yönəldilmişdir. İnsan hüquqlarının və əsas azadlıqlarının beynəlxalq hüququn prinsiplərinə uyğun olaraq təmin edilməsi Azərbaycan Respublikasında dövlətin ali məqsədi kimi təsbit edilmişdir. Bir çox beynəlxalq hüquqi sənədlər Azərbaycan Respublikası Konstitusiyasının insan hüquq və azadlıqlarını təsbit edən üçüncü fəslinin əsasını təşkil etmişdir.

Konstitusiyanın qəbul edilməsindən sonrakı dövr ərzində Milli Məclis tərəfindən ölkə həyatının bütün sahələrini əhatə edən, dünya standartlarına cavab verən bir sıra qanunlar qəbul edilmişdir. Azərbaycan bir sıra beynəlxalq konvensiyalara qoşulmuş, Avropa Şurasına tamhüquqlu üzv qəbul olmuşdur.

Qeyd edək ki, baş vermiş bu dəyişikliklərdən, demokratik dəyərlərin inkişafına yönəldilmiş bir sıra islahatlardan irəli gələn hüquqi tənzimləmə öz əksini Konstitusiyada tapmalı idi. Bu dəyişikliklərlə əlaqədar olaraq 2002-ci il avqustun 24-də və 2009-cu il martın 18-də Konstitusiyaya əlavə və dəyişikliklər edilməsinə dair referendumlar keçirilmiş, xalqın iradəsinin nəticəsi olaraq Əsas Qanuna zəruri dəyişiklik və əlavələr edilmişdir. Bu əlavə və dəyişikliklər Azərbaycanda hüquqi, demokratik, dünyəvi dövlət quruculuğuna və vətəndaş cəmiyyətinin inkişafına öz töhfələrini vermişdir.

**Gülnar BƏXTİYARQIZI**

# ADPU-da 16 Noyabr - Beynəlxalq Tolerantlıq Günü münasibəti ilə tədbir keçirilib

Noyabr ayının 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) bu ali məktəbdə təhsil alan türkiyəli tələbələrin iştirakı ilə 16 Noyabr - Beynəlxalq Tolerantlıq Günü münasibəti ilə tədbir keçirilib. Tədbiri ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru, dosent Mehdi Abdullayev açaraq bu günün yaranma tarixi, tolerantlıq və multikulturalizm anlayışlarının mahiyyəti barədə ətraflı məlumat verib. Prorektor M.Abdullayev bildirib ki, UNESKO-nun 1995-ci il noyabr ayının 16-da keçirilən 28-ci sessiyasında 185 dövlətin iştirakı ilə tolerantlıq prinsipləri haqqında Bəyannamə qəbul edib. BMT Baş Assambleyasının 1996-cı ildə qəbul etdiyi qərara əsasən quruma üzv ölkələrə hər il noyabrın 16-nı Beynəlxalq Tolerantlıq Günü kimi qeyd etmək və bununla bağlı təhsil müəssisələrində, eləcə də geniş ictimaiyyət arasında müvafiq tədbirlər keçirmək tövsiyə olunub. Azərbaycanda bu gün 1999-cu ildən qeyd olunur. Tolerantlıq və multikulturalizm bir-biri ilə sıx bağlı olan anlayışlardır. Tolerantlıq dini dözümlülük, multikulturalizm isə çoxmədəniyyətlilik deməkdir. Tolerantlıq digər inanc və əqidələrə dözümlü yanaşmadır. Tolerantlıq insan hüquqları və vicdanı ilə bağlıdır. Tolerantlıq insan azadlıqları və hüquqlarının təsdiqi, plüralizm və demokratiya əsasında formalaşır. Tolerantlıq irqçiliyi, ksenofobiyanı, dini dözümsüzlüyü, terror və ekstremizmi birmənalı şəkildə rədd edir. Tolerant yanaşmanın zəif olması bu mənfi təzahürlərin güclənməsinə təkan verir. Buna görə də tolerantlıq və multikulturalizm hər bir cəmiyyət üçün çox vacib dəyərlərdir.




Prorektor M.Abdullayev çıxışına davam edərək bildirib ki, müstəqil Azərbaycan dövlətinin memarı və qurucusu, ulu öndərimiz Heydər Əliyev tolerantlılığı və multikulturalizmi dövlət siyasətinin əsas istiqamətlərindən biri elan etmiş, ölkəmizdə olan bütün xalqların, milli azlıqların, etnik qrupların bərabər hüquqlar əsasında yaşamaları üçün səmərəli əməli fəaliyyət göstərmişdir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin siyasi iradəsi və mütərəqqi siyasəti sayəsində bu gün ölkəmiz tolerantlıq və multikulturalizm baxımından bütün dünya üçün layiqli bir örnəkdir. Azərbaycanda bütün xalqlar və milli azlıqlar dini mənsubiyyətlərindən asılı olmayaraq, azad və müstəqil yaşayırlar. Onların dini etiqat azadlığı yüksək səviyyədə təmin edilmişdir. Ölkəmizdə bu mövzuda ardıcıl olaraq yüksək səviyyədə mötəbər beynəlxalq tədbirlər keçirilir. Çox təəssüflər olsun ki, son illər dünyada dini ekstremizmin və zorakılığın güclənməsi müşahidə olunur ki, bu da öz növbəsində müxtəlif faciələrə, qanlı qarşıdurmalara, müharibələrə səbəb olur.



Tədbirdə Bakı Slavyan Universitetinin Azərbaycan multikulturalizmi kafedrasının dosenti, tarix üzrə fəlsəfə doktoru Rauf Hacı çıxış edərək bildirib ki, Azərbaycan tarixən tolerant və multikulturalist bir ölkə kimi tanınıb. Bu bütün Türk dünyasının möhtəşəm abidəsi sayılan "Kitabi-Dədə Qorqud" dastanında da öz əksini tapıb. İslam dini də tolerantlıq və multikultural dəyərlərə böyük önəm verir. İkinci Dünya müharibəsindən sonra Avropada tolerantlıq və multikulturalizm istiqamətində müəyyən addımlar atılıb, BMT-nin müvafiq konvensiyası imzalanıb.

Hazırda Azərbaycanda tolerantlıq və multikulturalizm üçün əlverişli mühit mövcuddur. Azərbaycanda hər bir insan dini etiqadında azaddır. Ölkəmizdə xristian kilsələri, sineqoqlar bərpa edilib, müxtəlif dinlərin təmsilçilərinin dövlət büdcəsi hesabına cəmiyyətləri və mətbu orqanları fəaliyyət göstərir. Bir sözlə, bu gün Azərbaycanda tolerantlığın və multikulturalizmin inkişafı üçün hər cür şərait yaradılıb.

Sonra ADPU-nun Tələbə Gənclər Təşkilatının üzvü Həsən İsmayılov çıxış edərək ulu öndər Heydər Əliyevin tolerantlıq barədə fikirlərini səsləndirib.

Tədbirdə çıxış edən Türkiyəli Tələbələrin İdarə Heyətinin sədri Mehmet Demirhan, Əcnəbi tələbələrlə iş üzrə şöbənin "Məktəbəqədər təlim və tərbiyə" ixtisasının tələbəsi Aylin Gündüz universitetdə onlar üçün yaradılmış əlverişli şəraitdən və obyektiv təhsil mühitindən razılıqlarını bildirib və Azərbaycanda özlərini öz vətənlərində kimi hiss etdiklərini vurğulayıblar. Tədbirdə tələbə-gənclərin mövzu ilə bağlı müxtəlif sualları cavablandırılıb.

**Leyla KƏRİMOVA,**
**"Türk araşdırmaları" elmi-tədqiqat mərkəzinin elmi işçisi**

# 9 Noyabr-Dövlət Bayrağı Günüdür

İlk olaraq qeyd edək ki, Azərbaycan Respublikasının bayrağı, gerbi və himni Azərbaycan dövlətinin müstəqilliyini təcəssüm etdirən müqəddəs rəmzlərdir. Dövlət atributu olaraq Azərbaycan bayrağına ehtiram göstərilməsi ölkə vətəndaşlarının müqəddəs borcudur. Qeyd edək ki, Dövlət Bayrağındakı üç rəngin ifadə etdiyi və XX əsrin əvvəllərindəki milli istiqlal ideologiyamızın üç təməl prinsipini təşkil edən "Türkçülük, islamçılıq və müasirlik" şüarının müəllifi görkəmli mütəfəkkir Əli bəy Hüseynzadədir. Azərbaycanda üçrəngli Dövlət Bayrağı ilk dəfə 1918-ci il noyabr ayının 9-da Azərbaycan Xalq Cümhuriyyəti hökumətinin qərarı ilə qəbul olunmuşdur. 1920-ci il aprel ayının 28-də Azərbaycanda Xalq Cümhuriyyəti süqut etdikdən və Sovet hakimiyyəti qurulduqdan sonra bu bayraqdan imtina edilmişdir.

Üçrəngli bayraq ikinci dəfə 1990-cı il noyabrın 17-də Naxçıvan Muxtar Respublikası Ali Məclisinin sədri, xalqımızın ümummilli lideri Heydər Əliyevin təşəbbüsü və rəhbərliyi ilə keçirilən sessiyada Naxçıvan Muxtar Respublikasının Dövlət Bayrağı kimi qəbul edilmişdir. Eyni zamanda Naxçıvan Muxtar Respublikası Ali Məclisi Azərbaycan SSR Ali Soveti qarşısında üçrəngli bayrağın Azərbaycanın rəsmi dövlət rəmzi kimi tanınması haqqında vəsatət qaldırmışdır. 1991-ci il fevral ayının 5-də xalqın tələbi ilə Ali Sovet "Dövlət Bayrağı haqqında" Qanun qəbul edərək üçrəngli bayrağa Dövlət Bayrağı statusunu vermişdir. 1991-ci il oktyabr ayının 18-də "Azərbaycan Respublikasının dövlət müstəqilliyi haqqında Konstitusiya Aktı" ilə dövlət müstəqilliyini bərpa edən Azərbaycan Respublikası özünü Azərbaycan Xalq Cümhuriyyətinin varisi elan edərkən onun dövlət rəmzlərini, o cümlədən Dövlət Bayrağını qəbul etmişdir.

"Azərbaycan Respublikasının Dövlət Bayrağı haqqında" Əsasnaməyə görə, Dövlət Bayrağı Azərbaycan dövlətinin suverenliyinin rəmzidir. Dövlət Bayrağı eni bərabər olan rəngli üç üfüqi zolaqdan ibarət düzbucaqlı parça şəklindədir: üst zolaq mavi rəngdə, orta zolaq qırmızı rəngdə, aşağı zolaq yaşıl rəngdədir. Bayrağın hər iki üzündə qırmızı zolağın ortasında ağ rəngli aypara və səkkizguşəli ulduz təsvir vardır. Bayrağın eninin uzununa nisbəti 1:2-dir. Ayparanın və səkkizguşəli ulduzun təsvirləri tərəflərinin nisbəti 3:4 olan düzbucaqlının içərisində yerləşir; düzbucaqlının diaqonalı bayrağın eninin 1/2-nə bərabərdir. Ayparanın təsviri konsentrik (eyni mərkəzli) olmayan iki dairənin hissələri şəklindədir; böyük dairənin diametri xarici düzbucaqlının eninə, kiçik dairənin diametri isə bayrağın eninin 1/4-nə bərabərdir. Kiçik dairənin mərkəzi bayrağın həndəsi mərkəzindən sol tərəfdə, bayrağın eninin 1/60-nə bərabər olan məsafədə yerləşir. Səkkizguşəli ulduzun təsviri ayparadan sağda yerləşir, ulduzun xarici dairəsinin diametri bayrağın eninin 1/6-ni, daxili dairəsinin diametri isə 1/12-ni təşkil edir.



Rənglərin rəmzi mənasına gəldikdə isə mavi rəng - Azərbaycan xalqının türk mənşəli olmasını, qırmızı rəng - müasir cəmiyyət qurmaq, demokratiyanı inkişaf etdirmək istəyini, yaşıl rəng - islam sivilizasiyasına mənsubluğunu ifadə edir.

2007-ci il noyabrın 17-də Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən Bakı şəhərində Dövlət Bayrağı Meydanının yaradılması haqqında Sərəncam imzalanıb. Ölkə Prezidentinin 2009-cu il noyabrın 17-də Dövlət Bayrağı Gününün təsis edilməsi haqqında imzaladığı Sərəncama əsasən hər il noyabrın 9-u Azərbaycanda Dövlət Bayrağı Günü kimi qeyd olunur.

Dövlət Bayrağı Meydanının təməli 2007-ci il dekabr ayının 30-da Bakının Bayıl qəsəbəsində Prezident İlham Əliyevin iştirakı ilə qoyulub. Meydan üçün seçilmiş yer Dövlət Bayrağının paytaxtın müxtəlif nöqtələrindən görünməsinə imkan yaradır. Ümumi ərazisi 60 hektar, yuxarı hissəsinin sahəsi 31 min kvadratmetr olan meydanda bütün infrastruktur yaradılıb. Xüsusi layihə əsasında reallaşdırılan tikinti işlərini xarici və yerli mütəxəssislər həyata keçiriblər.

15 seksiyadan ibarət olan bayraq dayağının hündürlüyü 162 metrdir. Qurğunun ümumi çəkisi 220 tondur. Bayrağın eni 35 metr, uzunluğu 70 metr, ümumi sahəsi 2450 kvadratmetrdir. Dövlət Bayrağının çəkisi 350 kiloqram, bünövrəsinin diametri 3,2, bünövrənin üst hissəsinin diametri 1,09 metrdir. Ən son texnologiyaların tətbiqi nəticəsində ucaldılmış bayraq dirəyi 58 m/san (209 km/saat) sürətli küləyə davam gətirə bilər.

Ginnes dünya rekordlar təşkilatı 2010-cu il mayın 29-da Azərbaycanın Dövlət Bayrağı dirəyinin dünyada ən hündür bayraq dirəyi olduğunu təsdiq etmişdir. Meydanda qurulmuş bürüncdən hazırlanan və qızıl suyuna çəkilmiş Azərbaycan Respublikasının gerbi (çəkisi 16 ton), dövlət himninin mətni və ölkəmizin xəritəsi meydanın əzəmətini daha da artırır.

Dövlət Bayrağı Meydanının açılışı və Dövlət Bayrağının təntənəli qaldırılması 2010-cu il sentyabrın 1-də Azərbaycan Respublikasının Prezidenti, Silahlı Qüvvələrin Ali Baş Komandanı İlham Əliyev tərəfindən həyata keçirilmişdir. Mərasimdə ölkə ictimaiyyətinin nümayəndələri və xarici ölkə səfirləri iştirak etmişlər. Dövlət Bayrağımız Dövlət Himninin sədaları altında təntənəli surətdə qaldırılmış və bu mənzərə iştirakçılar tərəfindən heyranlıqla müşahidə olunmuşdur. Azərbaycan Prezidenti İlham Əliyev demişdir : "Bu gün ölkəmizin həyatında bir daha demək istəyirəm ki, tarixi, unudulmaz bir hadisə baş verir. Bu meydan nadir memarlıq abidəsidir. Bu bayraq bizim milli dəyərimizdir. Söhbət ondan getmir ki, bu gün bu bayraq dünyanın ən hündür bayrağıdır. Bəlkə nə vaxtsa, bir neçə ildən sonra başqa yerdə bundan da hündür bayraq qaldıra bilərlər. Məsələ onda deyil, məsələ ondadır ki, bu Bayraq Meydanının yaradılması Azərbaycanın gücünü, Azərbaycan xalqının öz dövlətinə sevgisini, dövlət rəmzlərimizə ehtiramımızı göstərir. Bu gün Azərbaycanın hər bir yerində Dövlət Bayrağı dalğalanır".

Meydanda Dövlət Bayrağı Muzeyi də yaradılmışdır. Dövlət Bayrağı Muzeyi 9 noyabr 2010-cu ildə Azərbaycan Prezidenti İlham Əliyev və xanımı Mehriban Əliyeva tərəfindən açılmışdır. Muzey ölkə Prezidenti İlham Əliyevin müvafiq Sərəncamı ilə inşa olunmuş Dövlət Bayrağı Meydanında yaradılmışdır. Prezident İlham Əliyevin təşəbbüsü ilə səkkizguşəli ulduz formasında yaradılmış muzey Dövlət Bayrağı Meydanında bayraq dirəyinin pyedestalının altında yerləşir.

Muzeydə müxtəlif dövrlərdə Azərbaycan ərazisində mövcud olmuş dövlətlərin, xanlıqların bərpa olunmuş bayraqları nümayiş olunur. Burada həmçinin, XVII-XVIII əsrlərə aid bayraqların uc elementləri, gerblər, Azərbaycan Respublikasının müxtəlif illərdə qəbul olunmuş Konstitusiya broşüraları, poçt markaları, pul nişanlarının nümunələri, orden və medallar da vardır.

Dünyada nadir muzeylərdən biri olan Dövlət Bayrağı Muzeyində Ginnes dünya rekordlar təşkilatının Azərbaycanın Dövlət Bayrağı dirəyinin dünyada ən hündür bayraq dirəyi olduğunu təsdiq edən sertifikatı nümayiş etdirilir.

**Gülnar SÜLEYMANOVA**

# ŞƏRƏFLİ ÖMÜR YOLU

***Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) professoru, fizika-riyaziyyat üzrə elmlər doktoru, Azərbaycan Yazıçılar Birliyinin üzvü, istedadlı şair, nasir, publisist Vaqif Nəsirin yetmiş yaşı tamam oldu. Yetmiş illik ömür yoluna diqqət yetirdikdə, görülən işləri, zəngin fəaliyyəti nəzərdən keçirdikdə gözlərim önündə şərəfli bir ziyalı ömrü canlanır. İlk olaraq onu deyim ki, Azərbaycan mədəni mühiti bütün mərhələlərdə həmişə böyük uğurları, ciddi yaradıcı axtarışları, zəngin mədəniyyəti ilə diqqəti cəlb etmişdir. Bu gün də belədir. Sevindirici və nikbinlik doğuran tərəfi də budur.***



Hörmətli Vaqif müəllim, sizi məhz bu müstəvidə, mühit və ziyalı xəttində yaddaşımdan keçirirəm. Tanıdığım qədərində fikirlərimi bölüşmək məqsədindəyəm. Mənə belə gəlir, az da tanımıram. Bədii yaradıcılığınızı dönə-dönə izləmişəm və yenə də izləməkdəyəm. Ən çox oxuduğum müəlliflərdənsiniz. Müxtəlif vaxtlarda təəssüratlarımı, yaradıcılığınız haqqında qənaətlərimi mətbuat səhifələrində bölüşmüşəm. Kitablarınız stolüstü kitablarımdandır. Bir alim, fizika-riyaziyyat üzrə elmlər doktoru, professor, şair, nasir, publisist, ziyalı kimi diqqətimdə olmusunuz. Vaqif müəllim, sizi, sizin zəngin yaradıcılığınızı məhz bu mürəkkəbliklərdə nümunə kimi görmüşəm. Sözün həqiqi mənasında ziyalı nümunəsisiniz.

Son dövrlərdə yazdığınız şeirlərin mühüm bir qismi müasir dünyamızda baş verən faciəli ictimai-siyasi hadisələrin bədii əksidir. Siz şair olaraq bunları daxilinizdə yaşadırsınız. Görkəmli şairimiz Hüseyn Arif "bir xalqa atadır, anadır şair" deyirdi. Siz də "çəmənində gülləri top səsindən solan mən", "öz elində, yurdunda qaçqın, köçkün olan mən" deyəndə məhz problemlərin nə qədər müşkül olduğunu dilə gətirirsiniz. Son olaraq "dünya məni eşitmir" deyirsiniz. Burada mən xalqı işarələyir və bir xalqın səsinin, üzləşdiyi bəlanın hayqırtısının dünyaya çatdırılması məramı daşıyır.

Vaqif müəllim, sizin ömür yolunuz ziqzaqlarla, həyatın müxtəliflik və rəngarəngləkləri ilə doludur. Siz bir şair və alim ömrünü yaşamısınız. Azərbaycan elminə, mədəniyyətinə lazımi qədər töhfələr vermisiniz. Bu töhfələrin hədiyyəsi başqadı, sonsuzluqlarla ölçülür. Fizika-riyaziyyat üzrə elmlər doktoru kimi fəaliyyətiniz (tədqiqatlar, yazdığınız dərslik və dərs vəsaitləri) bugünkü elmimizin uğurlarıdır. Məsələn, "Optik şəffaf kristallarda polimorfizm" əsəriniz bunun nümunəsidir. Təkcə onu demək kifayətdir ki, siz Rusiya, Fransa fizika məktəbinin nümayəndələri ilə birgə tədqiqatlar aparmısınız. Gənc yaşlarınızda elmə böyük həvəslə gəlişiniz və istedadınız adınızın Rusiya və Fransa fizika məktəbinin sırasına yazılmasına səbəb olmuşdur. Siz görkəmli fizik A.Kitayqarodski, M.Maqanın rəhbərliyi altında çalışmısınız, onların yetirməsisiniz. Renn Universitetində, Bordo Universitetində, Marsel Universitetində, Strasburq Universitetində, Tuluza Universitetində keçən əsrin 70-ci illərində çıxışlarınız özü bir tarixdir. İndi siz ömrün yetmişində həmin illəri xatırlayanda böyük fəxr və qürur hissi keçirə bilərsiniz.

Vaqif müəllim, bu yetmiş illik ömür yolunda mühüm bir hissə Əlcəzairlə bağlıdır. "Ömrün qürbət payı" əsəriniz bizə Əlcəzairin tarixi, mədəniyyəti, keçib gəldiyi yol haqqında müfəssəl məlumat verir. Açığını deyim, mən öz bilgilərimi, Əlcəzair haqqında təsəvvürlərimi sizin kitabınızla dolğunlaşdırdım və oradan lazımi qədər məlumat ala bildim. Bu kitabda sizin fəaliyyətinizin, tədqiqatçılıq bacarığınızın daha bir tərəfini aşkarladım. Burada hisslərinizin, şair təbiətinizin, alim təfəkkürünüzün birliyinin rolu az olmayıbdır. Müxtəlif müstəvilərdə baxışınız bizə onu da deməyə əsas verir ki, "Ömrün qürbət payı" sizin mükəmməl yaradıcı qabiliyyətinizin faktıdır. Vaqif müəllim, siz Əlcəzair Milli Yüngül Sənaye İnstitutunda bir alim kimi pedaqoji fəaliyyətə başladınız. İstedadınız, insanlarla münasibət qura bilmək bacarığınız, müəllimlik və alimlik qabiliyyətiniz az keçmədi ki, kollektivin sevimlisinə çevrilməyinizə əsas oldu. Burada digər bir fərqləndirici keyfiyyətinizi də deyim. Siz həm də şair idiniz. Ulu Yaradanın verdiyi bu dəyərlər sizin həmişə ucalığa, yaxşılıqlara, ətrafınızın sevimlisinə çevrilməyinizə əsas olmuşdur. Məhz bütün bunların nəticəsi idi ki, Əlcəzairdə bir il fəaliyyət göstərdikdən sonra kafedra müdiri vəzifəsinə irəli çəkildiniz. Tələbələrin ehtiyacına hesablanmış dərslik və dərs vəsaitləri yazdınız. Əlcəzairdə tələbələr üçün fransız dilində yazdığınız 5 monoqrafiya bunun göstəricisidir.

Azərbaycan elmi zaman-zaman böyük uğurlara imza atmışdır. Elmin, mədəniyyətin müxtəlif sahələrində görülən işlər, böyük şəxsiyyətlərin əldə etdiyi uğurlar bunun bariz nümunəsidir. Bu məmləkətin min illər boyu müəyyənləşmiş dəyər, mənəviyyat sistemi, formalaşmış düşüncəsi Vətənə, milli mənsubluğa hesablanıbdır. Rusiyanın Azərbaycanı işğalından sonra biçarə Vətən nələrlə qarşılaşmadı?! İrəvan və Zəngəzur kimi tarixi mədəniyyət ocaqları söndürüldü. Azərbaycan torpaqları hesabına Ermənistan yaradıldı. Bu rus çarizminin, Sovet ideologiyasının Azərbaycana, türk xalqlarına münasibətinin faktıdır. Axıska türklərinin, kırım tatarlarının tarixi vətənlərinin yox edilməsi də unudulmayıb. Bunları təsadüfən demirəm. Bütün bu hadisələr Azərbaycan ziyalısının içindən keçir. Sizin içərinizdə hansı ağrıların olduğunu yazılarınızdan, söhbətlərinizdən, şair olaraq misralarınızdan görməmək mümkün deyildir. Haqqınızda düşüncələrimi qələmə alan zaman türk aliminin Nobel mükafatı aldığını televiziyadan eşitdim. Daxildə və xaricdə türkə, Azərbaycana qarşı nə qədər sərhədlər yaradılsa da, yenə də Uca Tanrının verdiyinin qarşısını kəsmək olmur.

Fikrimcə, xalqımızın milli-mənəvi dəyərlərindən böyük sərvəti yoxdur. O sərvətin isə qoruyucuları, ona sahib duranlar, sabahlara daşıyanlar ilk növbədə, sizin kimi ziyalılardır, Vaqif müəllim! Şair, ziyalı kimi, milli-mənəvi mədəniyyətimizin təlqin və təbliğində əvəzsiz rolunuz vardır. Yenə yadıma sevimli şairimiz H.Arifin misraları düşür. O, deyirdi: "Füzuli çəkəni, Sabir çəkəni, dəvələr daşıyıb, fillər çəkməyib". Həqiqətən də, belədir. Bizə yaxın zamanın məlum, məşhur ibrət dərsləri var. XIX əsrin II yarısında, XX əsrin əvvəllərindəki ziyalılarımız sözün həqiqi mənasında fədakarlıq nümunəsidirlər. M.F.Axundzadə, H.Zərdabi, X.Natəvan, Y.V.Çəmənzəminli, S.M.Qənizadə, M.Mahmudbəyov, E.Sultanov, H.Ə.Qaibov, S.S.Axundov, R.Əfəndiyev, C.Məmmədquluzadə, Ö.F.Nemanzadə, B.Çobanzadə, Ə.Ağayev, Ə.Hüseynzadə, M.Ə.Rəsulzadə və onlarla başqaları Azərbaycanın sabahlara gedən yolunun müəyyənləşməsində hər cür məşəqqətlərdən keçiblər. XX əsrin sonları da bu cür oldu. Azərbaycanın ziyalı ordusu müxtəlif təzahürlərə baxmayaraq, hər cür məhrumiyyətlərdən keçməklə müstəqilliyimizə imza atdılar. Xalqların, etnosların yüz illər boyu mübarizə apardıqları amalların içərisində ən birincisi müstəqil dövlətlərini yaratmaqdır. Ulu Yaradanın inayəti ilə buna nail olduq. Sizin yaradıcılığınız, poeziyanız həmin tarixin ifadə faktıdır. Vaqif müəllim, həmin tarixin bütün ağrıları digər vətənpərvər ziyalılarımız kimi sizin də yaradıcılığınızda öz əksini tapıb. "Dünya niyə eşitmir", "Fəryad", "Dəhşət", "Azəri qızı", "Azərbaycan", "Cahargah oxu", "Bu necə qəbiristanlıq", "Monoloq", "Hara qaçım", "Vətənə qayıdış", "Bu necə həyatdır", "Ulu haqqa", "Utanıram" ,"Bir alimə" və digər şeirləriniz Vətən sevgisindən yoğrulmuşdur. Ədəbiyyatşünas alimimiz A.Əliyev bütün bunları yaradıcılığınız timsalında ümumiləşdirərək yazmışdır: "Vaqif taleyinə düyün vurulmuş bir məmləkət olan Azərbaycan dünyasının bu günü üçün narahatdır. Bu narahatçılığın arxasında qlobal xarakterli problemlər dayanır. Məhz bu problemlər vətəndaş, alim, şair Vaqif Nəsiri düşündürməyə bilməz. Onun düşüncələr aləmi bir karvan yüküdür".

Vaqif müəllim, siz İkinci Dünya müharibəsinin qurtardığı ildə, 1945-ci il oktyabrın 4-də dünyaya gəlmisiniz. Həmin müharibənin ağrılarını yaşamış insanlardansınız. Əlbəttə, o illərin faciələri, çətinlikləri sizlərin də taleyindən keçib. Bütün olanlara baxmayaraq, həyat özü sizləri mətinləşdirdi, bacarığınızı, imkanlarınızı ortaya çıxardı. "Anama" şeiriniz bir insan taleyinin şəxsində böyük bir nəslin, o dövrün ağrılarını yaşayanların bütünlükdə həyatına aydınlıq gətirir. Bu tip şeirlər Azərbaycan ədəbiyyatında kifayət qədərdir. Müharibə mövzusu ədəbiyyatımızda ayrıca tədqiq olunmalı problemdir. Düzdür, bu istiqamətdə müəyyən yazılar var, təhlillər aparılıb, ancaq həmin dövrü ifadə edən ədəbiyyat daha ciddi ararşdırmalara ehtiyaclıdır. "Atamı itirdim körpə yaşımda, sən verdin ömründən mənə pay, ana". Və yaxud da "o dəhşətli günlər üzünə çəkdi, çətin həyatının xəritəsini" deyəndə böyük bir nəslin həyatı göz önünə gəlir. Vaqif müəllim, siz də həmin müşküllərdən keçdiniz, amal və məqsəd uğrunda mübarizə üçün mətinləşdiniz.

Sizin "Masallı", "Boradigah", "Qəbələ", "Kəlbəcər" kimi şeirləriniz var. Bunlar bizim üçün Vətən sevgisinin nümunəsidir. Bu Vətəni min illər boyu ulularımız ərməğan olaraq bizlərə qoruyub çatdırıblar. "Sabahı işıqlı, nurlu səhərsən, hicranı dözülməz dərdsən, qəhərsən" deyəndə bu misraların alt qatında çox dərin mətləblər gizlənir. Oxucunu düşünməyə yönləndirirsiniz, Vətən sevgisinin sonsuzluğunu, yurd yerlərinin müqəddəsliyini təlqin edirsiniz. "Kəndim" şeiri bunun klassik nümunəsidir. "Rahatlıq bilmirəm səndən aralı, burda dincliyimi qoyub getmişəm" və ya "Hanı qoca palıd, sehirli bulaq, tarixə söykənib uyuyan evlər" kimi misralar sizin yaradıcı ruhunuzu, şair olaraq hansı duyğulara köklədiyinizi aydınlaşdırır. Sizin zəngin poeziyanız ayrıca təhlilləri zəruri edir. Onun başlanğıcı qoyulub, ancaq sistemli araşdırılması ədəbi-nəzəri fikrin heç şübhəsiz vaxtaşırı marağında olacaqdır. "Sonradan bilmişəm", "Dünya çətin düzələ", "Öz odunda yanan ürək", "Dərd budur", "Qardaş harayı", "Anamın duaları" və s. kitablarınızın zənginliyi, mətn dinamikası, poetik sistemi, məzmu aktuallığı ilə orijinallıq sərgiləyir. Sizin "Dərd budur" kitabınızı təhlil edərkən mən bir etnoqraf alim kimi bir məqamı xüsusi vurğulayaraq yazmışam ki, "onun poeziyası bədii sözün yüksək nümunəsidir və onun poeziyasının səviyyəsi həm də yüksək alimlik dərəcəsindən xəbər verir".

Şeirlərinizdə çoxlu istiqamətlər var. El-oba, yurd, Vətən sevgisindən tutmuş təmiz sevgi hisslərinin tərənnümünə qədər böyük rəngarənglikdə görünür. Hamısı da nümunə olaraq tipik xarakterlidir. "Məhəbbəti qoruyun", "Məhəbbətindir", "Mən deyiləmmi", "Ay işığında", "İstəyirəm", "Bir gülün eşqiylə açılan könül" və sair şeirləriniz sizin iç dünyanızın, sənətkar amalınızın tərəfləridir. Bunlar həm də bir örnəkdir, gələcək üçün, bütünlükdə gənclik üçün çağırışdır. "Məhəbbəti qoruyun" bunun tipik nümunəsidir.

Vaqif müəllim, bütün bunların arxasında sizin şəxsiyyətiniz dayanır. Şəxsiyyət olaraq siz özünüzü hərəkətləriniz, davranışınız, həyat hadisələrinizə münasibətinizlə ifadə etmisiniz. Yaradıcılığınız da sizin şəxsiyyətinizin ifadəsidir. Müəllim kimi fəaliyyətinizdə də bu mühüm olandır. Mən sizin tələbələrə münasibətinizin canlı şahidiyəm. Siz müəllim adına ucalıq gətirənlərdənsiniz. Məhz bu səbəbdəndir ki, ailədə, eldə-obada, tələbələriniz arasında böyük qayğı və sevgi ilə əhatələnmisiniz.

Hörmətli Vaqif Nəsir, siz 70 yaşa şair Vaqif Nəsir, alim Vaqif Nəsirov, müəllim - Vaqif müəllim kimi gəlib çatmısınız. Həyatınızı xalqımıza, mədəniyyətimizə, elmimizə xidmətə həsr etmisiniz. Bu çox gərəkli olandır. Hər adama da nəsib olmur. Sizin müqtədirliyinizi xalqımız, sizi tanıyanlar yaxşı bilir və qiymətləndirir. Böyüklüyü, uca olmağı bacaranlardansınız. Bizlərə nümunəsiniz.

**Mahmud ALLAHMANLI,**
**Azərbaycan və dünya ədəbiyyatı kafedrasının professoru,**
**filologiya üzrə elmlər doktoru**

## "Açılış kuboku"nun yarımfinal və final mərhələsi keçirilib

Noyabr ayının 8-də "Boulevard Side Hotel"-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT), Azərbaycan İntellektual Oyunlar Klubunun (AİOK) və "Akademiya" Tədris Mərkəzinin birgə təşkilatçılığı ilə Azərbaycan İntellektual Hərəkatının tarixinə düşən "Açılış kuboku"-nun yarımfinal və final mərhələsi keçirilib. Qeyd edək ki, əvvəlcə hər birində 16 komandanın iştirak etdiyi 12 sualdan ibarət 2 yarımfinal oyunu keçirilib. İOK-un rəhbəri Ülvi Şamilovun səsləndirdiyi 24 sualdan sonra hər yarımfinal oyunundan 8 komanda olmaqla, ümumilikdə 16 komanda finala vəsiqə qazanıb. ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev final mərhələsini giriş sözü ilə açaraq tələbə-gənclərə uğurlar arzulayıb. Sonra TGT-nin sədri Cavid Hüseynov da çıxış edərək komandalara uğurlar arzulayıb. Daha sonra isə "Akademiya" Tədris Mərkəzinin baş meneceri Orxan Qasımov iştirakçıları müxtəlif kampaniyalar haqqında məlumatlandırıb. Səslənən 24 sualdan sonra qaliblər müəyyənləşib. Yüksək səviyyədə keçən final oyununun sonunda Coğrafiya və gənclərin çağırışaqədərki hazırlığı fakültəsinin "Hərbiçilər" komandası 12 xal ilə I yeri, Kimya fakültəsinin "Maxito" komandası 11 xal ilə II yeri, III yeri isə Coğrafiya və gənclərin çağırışaqədərki hazırlığı fakültəsinin "Soliders" komandası 10 xal ilə tutublar. Müvafiq olaraq I yeri tutan "Hərbiçilər" komandasının üzvləri planşet, II yeri tutan "Maxito" komandasının üzvləri mp3 player, III yeri tutan "Soliders" komandasının üzvləri isə saat qazanıblar. Eyni zamanda bütün komandalar diplom və kubokla mükafatlandırılıblar. Məlumat üçün onu da bildirək ki, "Açılış kuboku"nun final mərhələsində AİOK-un prezidenti Aydın Piriyev və "Akademiya" Tədris Mərkəzinin direktoru Elşən Abbasov fəxri qonaqlar qismində iştirak ediblər.

**Ramid SEYFULLAYEV,**
**Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin III kurs tələbəsi**

# Kitabxanamız zənginləşir

1. İlham Əliyev. “İnkişaf - məqsədimizdir”. İyirmi ikinci kitab. dekabr 2006-fevral 2007. Bakı, “Azərnəşr”,2015, 384 səh.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin “İnkişaf- məqsədimizdir” çoxcildliyinin bu cildində ölkəmizin çoxşaxəli sosial-iqtisadi inkişaf strategiyasının inamla davam etdirilməsi, yeni infrastruktur layihələrin həyata keçirilməsi, xalqımızın rifahının daha da yaxşılaşdırılmasına aid materiallar, ictimai-siyasi həyatda fəal sosial təbəqə kimi yaxından iştirak edən gənclərlə bağlı çıxışları, nitqləri, tövsiyələri dərc olunmuşdur.

2. İlham Əliyev. “İnkişaf - məqsədimizdir”. İyirmi üçüncü kitab. mart 2007-aprel 2007. Bakı, “Azərnəşr”, 2015, 400 səh.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin oxuculara təqdim olunan “İnkişaf-məqsədimizdir” çoxcildliyinin bu cildində ölkəmizin iqtisadi, siyasi, mədəni həyatına, regionların sosial-iqtisadi inkişafına və problemlərinə həsr olunmuş çıxış və nitqləri, göstərişləri öz əksini tapmışdır.

3. İlham Əliyev. “İnkişaf-məqsədimizdir”. İyirmi dördüncü kitab. aprel 2007-iyun 2007. Bakı, “Azərnəşr”, 2015, 408 səh.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin “İnkişaf-məqsədimizdir” çoxcildlik əsərlərinin bu cildində Azərbaycanın beynəlxalq aləmdə artan nüfuzuna, iqtisadi potensialının möhkəmlənməsinə, regionların sosial inkişaf proqramının həyata keçirilməsi ilə əlaqədar Qazax, Tovuz rayonlarına, Gəncə şəhərinə səfərləri, bu rayonların sosial, iqtisadi və mədəni cəhətdən inkişafına həsr olunmuş çıxışları, nitqləri, tövsiyələri öz əksini tapmışdır.

4. “İlham Əliyevin uğurlu ekoloji siyasəti”. II. Bakı, Ekologiya və Təbii Sərvətlər Nazirliyi. 2015, 383 səh.

5.Seyidzadə Etibar. “Elektron cədvəllər”. Təlim vəsaiti. Bakı, Qafqaz Universiteti, 2014, 94 səh.

6. Seyidzadə Etibar. “Mətn prosessoru”. Təlim vəsaiti. Bakı, Qafqaz Universiteti, 2014, 86 səh.

7. Verdiyev Etibar. “Təqdimat”. Təlim vəsaiti. Bakı, Qafqaz Universiteti, 2014, 108 səh.

8. Tahirov Nail. “Layihə planlaması”. Qafqaz Universiteti, Tempus, 2015, 58 səh.

9. İbiyev Fikrət, Məmmədov Fərman, Seyidzadə F. “Kompüterin əsasları əməliyyat sistemi”. Təlim vəsaiti. Bakı, Qafqaz Universiteti, 2014, 131 səh.

10. Kəlbiyeva Solmaz. “Rəsm üzərində redaktə”. Qafqaz Universiteti, “Tempus”, 2015, 148 səh.

11. “Çexovdan Markesə qədər”. Seçmə hekayələr toplusu. “ Azərbaycan Respublikasının Nazirlər Kabineti yanında Tərcümə Mərkəzi” . Bakı, 2015,408 səh.

Bu toplu XX əsr dünya ədəbiyyatının mənzərəsini hekayə və novellalar vasitəsilə işıqlandırmağa cəhd edir.

12. Patrik Modiano. “Seçilmiş əsərləri”. “Azəbaycan Respublikasının Nazirlər Kabineti yanında Tərcümə Mərkəzi”. Bakı, 2015, 672 səh.

13. “Sözün Aydını”. (məqalələr, tərcümələr və müsahibələr toplusu). Azərbaycan Respublikasının Nazirlər Kabineti yanında Tərcümə Mərkəzi. Bakı, 2015, 528 səh.

Bu kitabda görkəmli alim, ictimai-siyasi xadim, tənqidçi, ədəbiyyatşünas Aydın Məmmədovun əsərləri-elmi məqalələri, müsahibələri, müxtəlif mözularda etdiyi çıxışları toplanmış, alim haqqında tanınmış sənət adamlarının yazıları yer almışdır.

14. Oljas Süleymenov. “Az-Ya”. Azərbaycan Respublikasının Nazirlər Kabineti yanında Tərcümə Mərkəzi. Bakı, 2015, 360 səh.

15. Matilda Urrutia. “Pablo Nerudayla yaşanan ömür”. Azərbaycan Respublikasının Nazirlər Kabineti yanında Tərcümə Mərkəzi. Bakı, 2014,256 səh.

16. “Latın Amerikası romanı”. “Azərbaycan Respublikasının Nazirlər Kabineti yanında Tərcümə Mərkəzi”. Bakı, 2014, 248 səh.

Onettinin (1909-1994) “Girdab”, Sabatonun (1911-2011) “Tunel”, Markesin (1928-2014) “Mənim küskün gözəlçələrim” və Varqas Lyosanın (1936) “Küçüklər” əsəri ayrı-ayrı ölkələri təmsil etsələr də, onları eyni məfhum - “Latın Amerikası” məfhumu birləşdirir.

17.Yasmina Mixayloviç. “Xəzər dənizinin sahillərində”. Azərbaycan Respublikasının Nazirlər Kabineti yanında Tərcümə Mərkəzi. Bakı, 2015, 192 səh.

18. “Azərbaycanın enerji siyasəti Qərb mətbuatında”. Azərbaycan Respublikasının Nazirlər Kabineti yanında Tərcümə Mərkəzi. Bakı, 2015, 288 səh.

“Azərbaycanın enerji siyasəti Qərb mətbuatında” adlı topluya son illərdə Qərb mətbuatıda Azərbaycanın enerji siyasəti ilə bağlı dərc olunmuş məqalə və analitik yazılar daxil edilmişdir.

19. “Xilas yolunun yolçuları”. Azərbaycan Respublikasının Nazirlər Kabineti yanında Tərcümə Mərkəzi. Bakı, 2014, 320 səh.

Görkəmli yazıçı Afaq Məsudun dilimizə çevirdiyi bu kitabı Azərbaycan oxucusuna ilk dəfə çatdırılan gizli ilahi həqiqətlər hücrəsi adlandırmaq olar.

20. Akutaqava Rünoske. “Tanrıların istehzası”. Azərbaycan Respublikasının Nazirlər Kabineti yanında Tərcümə Mərkəzi. Bakı, 2015, 352 səh.

21. “Bəşəri poeziya”. Azərbaycan Respublikası Nazirlər Kabineti yanında Tərcümə Mərkəzi. Bakı, 2014, 252 səh.

“Bəşəri poeziya” tərcümə toplusunda dünya poeziyasının müxtəlif nümayəndələrinin şeirləri yer alıb.

22. “Səxsiyyətin harmoniyası”. Bakı, “Elm və təhsil”, 2015, 120 səh.

“Səxsiyyətin harmoniyası” kitabı 37 il prokurorluq orqanlarında işləmiş Mobil Vahid oğlu İsmayılovun həyat və fəaliyyəti haqqında yazılmış məqalələr toplusudur.

23.Sənan İbrahimov. “Qədim və orta əsrlər İran, Əfqanıstan, Tacikistan ədəbiyyatı”. Bakı, “MBM”, 2015, 608 səh.

Kitabda İran, Əfqanıstan və Tacikistan ərazisində yaranmış ədəbiyyat şərh edilir.

24. Sənan İbrahimov. “Azərbaycan ədəbiyyatşünaslığının tarixi, metodologiyası və problemləri”. Bakı, Bakı Dövlət Universiteti, 2012,183 səh.

25. Ernest Heminquey. “Qadınsız kişilər” (roman və hekayələr). Azərbaycan Respublikasının Nazirlər Kabineti yanında Tərcümə Mərkəzi. Bakı, 2015, 472 səh.

26. Mirzadə Mustafa Fəxrəddin Ağabalı. “Hümayi - ərş”. Qarabağlı Şeyx Mir Həmzə Nigarinin Mənaqibnaməsi. Qafqaz Universiteti, 2015, 496 səh.

27. “Azərbaycan Respublikasının coğrafiyası”. Fiziki coğrafiya. I cild. Bakı, 2014, 530 səh.

“Azərbaycan Respublikasının coğrafiyası” üçcildliyinin birinci cildində ölkə ərazisində fiziki coğrafiyanın müxtəlif sahələrinə aid çox illər ərzində aparılan kompleks tədqiqatlar ən son məlumatlar nəzərə alınmaqla ümumiləşdirilərək təqdim olunmuşdur.

28. “Azərbaycan Respublikasının coğrafiyası”. İqtisadi, sosial və siyasi coğrafiya. II cild. Bakı, 2015, 328 səh.

Oxuculara təqdim olunan “Azərbaycan Respublikasının coğrafiyası” kitabının ikinci cildi ölkənin müasir iqtisadi - coğrafi problemlərini, onun həlli yollarını işıqlandıran geniş həcmli və konstruktiv xarakter daşıyan elmi əsərdir.

29. “Azərbaycan Respublikasının coğrafiyası”. Regional coğrafiya. III cild. Bakı, 2015, 400 səh.

Oxuculara təqdim olunan “Azərbaycan Respublikasının coğrafiyası” kitabının üçüncü cildi regionların müasir fiziki və iqtisadi - coğrafi problemlərini, onların həlli yollarını işıqlandıran geniş həcmli və konstruktiv xarakter daşıyan elmi əsərdir.

30. R. R. Abdurazaqov, D. S. Nağıyeva, X. İ. Padarov. “Ümumtəhsil kurikulumunun əsasları”. Bakı, 2015, ADPU, 137 səh.

31. “Dədə Qorqud günü”. XIV Elmi Sessiyanın materialları. Bakı, “Elm və təhsil”, 2014, 80 səh.

32. “Azsaylı xalqların folkloru”. I kitab. Bakı, “Elm və təhsil”, 2014, 204 səh.

33. Nazim Mustafa. “İrevan şehri”. Türk-İslam varlığı nasıl yok edildi. Ankara, 2015, 269 səh.

34.Əzizxan Tanrıverdi. “Dədəm Qorqud”un zamanı”. Bakı, “Elm və təhsil”, 2015, 204 səh.

“Dədəm Qorqud”un zamanı” filologiya üzrə elmlər doktoru, professor Əzizxan Tanrıverdinin “Kitab”ın dilinə həsr etdiyi onuncu kitabdır. Monoqrafiyada zaman anlayışının leksik, morfoloji və sintaktik vasitələrlə ifadəsi tarixi - linqvistik baxımdan tədqiq edilir.

35. S.Quliyev, M.İsmixanov. “Müəllimlik ixtisasına giriş”. Bakı, ADPU, 2015,224 səh.

Vəsaitdə müəllim peşəsi, onun əsasları şərh olunur. Burada müəllim əməyinin sosial mahiyyəti, xüsusiyyətləri, müəllimin pedaqoji- etik prinsip və keyfiyyətləri, peşə qabiliyyətləri, pedaqoji ünsiyyət, pedaqoji ustalıq və takt, müəllim hazırlığı, bu sahədə pedaqoji təcrübənin, özünütəhsil və özünütərbiyənin rolu və digər məsələlər öz əksini tapmışdır.

36. “İlyas Tapdıq: biblioqrafiya”. Bakı, Köçərli adına Respublika Uşaq Kitabxanası, 2015, 248 səh.

Azərbaycan uşaq ədəbiyyatının görkəmli nümayəndəsi, tanınmış şair İlyas Tapdığın həyat və yaradıcılığına həsr olunmuş bu biblioqrafiyada görkəmli şairin 60 il ərzində qələmə aldığı bütün əsərləri və onun haqqında yazılan materiallar öz əksini tapmışdır.

37. K.Əsədov, O.H.Mirzəyev. “Azəbaycan meşələrinin nadir ağac və kolları”. Bakı, AMEA-nın Geologiya və Geofizika İnstitutu, 2015, 154 səh.

Kitab 82 nadir növlərdən və 82 rəngli şəkildən ibarətdir. Bundan 52 növü “Qırmızı kitab”da (2013) verilmiş, qalan 30 növ isə nadir və nəsli kəsilmək qorxusu olan bitkilər kimi “Qırmızı kitab”a daxil edilməyən növlərdir. Bitkilərdən 24 növü ağac, 58 növü isə koldur.

38. “Çağdaş folklor: problemlər, perspektivlər”. Bakı, “Elm və təhsil”, 2015, 232 səh.

Kitab tanınmış folklorşünas Füzuli Bayatın yaradıcılığı əsasında yazılan və şifahi söz sənətinin müxtəlif poblemlərini əhatə edən məqalələrdən ibarətdir.

39. Mayıl B.Əsgərov. “Linqvo - psixoloji vəhdət nəzəriyyəsi”. Bakı, “Elm və təhsil”,2015, 192 səh.

Bu tədqiqatda dilçilik və psixologiya elmlərinin qovşağında yaranan, yeni bir istiqamətin əsasını qoyan “Linqvo - psixoloji vəhdət nəzəriyyəsi”nin tam elmi şərhi verilir.

40. “Dərbənd folklor örnəkləri”. I - ci kitab. Bakı, “Elm və təhsil”, 2014, 368 səh.

41.Yaşar Rzayev. “XIX əsr Azərbaycan ədəbiyyatı”. (Mühazirə materialları). Dərs vəsaiti. Bakı, “Elm və təhsil”, 2015, 220 səh.

42. M.İ.İlyasov, M.H.Nəzərov. “Didaktika”. Dərs vəsaiti. Bakı, ADPU, 2015, 113 səh.

Təqdim olunan dərs vəsaiti daim inkişafda və yeniləşməkdə olan təlim və təhsilin əsaslarını və bir sıra müasir problemlərini özündə əks etdirir.

43. A. C. Adıgözəlov, S. M. Nəcəfova, R. M. Qəmərli. “Ali riyaziyyatdan mühazirələr”. (Qeyri -ixtisas fakültələri üçün). Ali məktəb tələbələri üçün dərs vəsaiti. Bakı, ADPU, 2015, 221 səh.

Dərs vəsaiti Kimya fakultəsi tələbələri üçün nəzərdə tutulmuşdur.

44. Ə.N.Qurbanov, M.H.Şahbazov, A. Z. Məmmədova, G. G. Şəfaqətova. “Ümumi və qeyri - üzvi kimya praktikumu”. Ali məktəblər üçün dərslik. Bakı, ADPU, 2015, 270 səh.

Ali məktəblər üçün nəzərdə tutulmuş bu dərslik əsasən üç hissədən - kimyanın ümumi nəzəri əsasları, əsas yarımqrup və əlavə yarımqrup elementlər kimyasına aid praktik işlərdən ibarətdir.

45. “Şəki folklor örnəkləri”. II kitab. Bakı, “Elm və təhsil”, 2014, 408 səh.

46. “Soyqırımlar xalq yaddaşında”. Beynəlxalq Elmi Konfransın materialları. Bakı, “Elm və təhsil”, 2015, 296 səh.

Kitabda 2 mart 2015-ci ildə Bakı şəhərində Azərbaycan Milli Elmlər Akademiyasının “Azərbaycanlılara Qarşı Soyqırımların Tədqiqi” Komissiyası və AMEA Folklor İnstitutunun təşkilatçılığı ilə keçirilən “Soyqırımlar xalq yaddaşında” mövzusunda Beynəlxalq Elmi Konfransın materialları toplanmışdır.

47. Rza Xəlilov - 70. Bakı, “Elm və təhsil”, 2015, 84 səh.

48. Adil Cəmil - 60. Bakı, “Elm və təhsil”, 2015, 154 səh.

Kitab AMEA - nın Folklor İnstitutu “Türk xalqları folkloru” şöbəsinin aparıcı elmi işçisi, filologiya üzrə fəlsəfə doktoru, şair Adil Cəmilin 60 illik yubileyi münasibətilə hazırlanmışdır.

49. “İllər yorğun, mən yorğun...( Ramiz Əskər - 60 ). Bakı, “Elm və təhsil”, 2014, 204 səh.

Kitabda tanınmış türkoloq, ədəbiyyatşünas, şair, tərcüməçi, jurnalist, publisist, Bakı Dövlət Universiteti Türk xalqları ədəbiyyatı kafedrasının müdiri, filologiya üzrə elmlər doktoru, professor Ramiz Əskərin anadan olmasının 60 illiyi münasibətilə 10 yanvar 2014 - cü ildə Azərbaycan Milli Elmlər Akademiyası Folklor İnstitutunun keçirdiyi yubiley yığıncağının stenoqramı, yubiliyarın tərcümeyi - halı, həyatından bəzi epizodlar verilmiş, elmi əsərləri, kitabları, tərcümələri, elmi məclislərdə iştirakı və s. haqqında materiallar toplanmışdır.

50. Cəlal Bəydili ( Məmmədov). “İstiqbal xalq ədəbiyyatınındır”... ( Seçmə yazılar). Bakı, 2015, 312 səh.

51. Bağırov Əlisalam. “Başlanğıcdan başlanğıca və ya ruhun keçdiyi yol”. Bakı, “Qanun” Nəşriyyatı, 2015, 240 səh.

52. Xəlil Rza Ulutürk. “Yeni zirvələrə”. ( Şeirlər, poemalar) təkrar nəşr. Bakı, “APOSTROFF”, 2015, 192 səh.

“Yeni zirvələrə” kitabı Xalq şairi, milli ideal mücahidi, ilk “İstiqlal” ordenli X. R. Ulutürkün “Bahar gəlir” (1957), “Sevən gözlər” (1959), “Mənim günəşim” (1963), “Qollarını geniş aç” (1965), “Yeni zirvələrə” (1971) kitablarının təkrar nəşridir. Kitablardan bəzi şeirlər çıxarılmışdır.

53. “Azərbaycan şifahi xalq ədəbiyyatına dair tədqiqlər”. Elmi - ədəbi toplu. II. Bakı, “Elm və təhsil”, 2014, 136 səh.

54. Firidun Hüseynov. “Adi əhvalatlarda böyük həqiqətlər”. Bakı, “Xan” nəşriyyatı, 2015, 232 səh.

Kitab böyük realist Cəlil Məmmədquluzadə nəsrinin ideya-bədii xüsusiyyətlərindən bəhs edir.

**Nüşabə Əmirəliyeva,**
**Elmi kitabxananın məlumat-biblioqrafiya şöbəsinin müdiri**

## HAYALİM OL

Aşkla kapanan göz,
Umut ile açılır mı?
Umuda açılan göz aşkı bulur mu?
Kafamda bir milyon sor.
Sorularımın tek cevabı sen!
Sende cevabı ararken,
Cevapsızlıktan ölecek kalbim.
Kalbim çarpmıyor artık adını duyduğunda.
Seni sensizlik de seven adama ne oldu böyle?
Ne yaptın hayallerime?
Hayalsiz yaşar mı insan?
Gel ve tekrar hayalim ol benim.



## İNSAN

İnsanları anlamak,
Kalple bağlanmak insanlara,
Onlarda Allah'ın cemalini görmek.
Bir aşkla bağlanmak namaza.
Haydi gelin açalım elleri mevlaya.
Dualarla düzeltelim insanlığı.
İnsanlıkla insanlığı birleştirelim.
Hadi gidelim insanlığın kapısına,
O kapıyı geçip insan olalım.

**KADİR PALALI,**
**Əcnəbi tələbələrin hazırlığı şöbəsinin**
**“Korreksiyaedici təlim” ixtisasının tələbəsi**

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Riyaziyyat və informatika fakültəsinin dekan müavini, dosent Allahverdi Cəfərova əzizi

**Sahib Cəfərovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi pedaqogika kafedrasının dosenti Heydər Cəfərova bacısı

**Şövkət xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi İstehsalatın əsasları kafedrasının baş müəllimi

**Knyaz Əzimovun**

vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Funksiyalar nəzəriyyəsi kafedrasının baş müəllimi

**Arif Məmmədovun**

vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

Redaktor: Mənsur İBRAHİMOV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 3935
Sayı: 1500
Çapa imzalanıb: 30.11.2015-ci il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompüter mərkəzində yığılıb, “Azərbaycan” nəşriyyatında səhifələnib və “Azərbaycan” nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.